# Mündəricat


Mündəricat ----- ۵

HƏZRƏT ZEYNƏBİN (S.Ə.) HƏYATI ----- ۱۰

KİTAB HAQQINDA ----- ۱۰

İşarə ----- ۱۰

BİRİNCİ FƏSİL ----- ۱۰

VİLAYƏT ÇİÇƏYİ ----- ۱۰

İMAM HƏSƏN (Ə)-IN İMAMƏT DÖVRÜ ----- ۱۲

TƏVƏLLÜD ----- ۱۲

ATANIN ZİNƏTİ ----- ۱۳

SƏMAVİ AD ----- ۱۴

PEYĞƏMBƏR İLƏ BİRLİKDƏ ----- ۱۴

DƏRDLİ YUXU ----- ۱۴

BİRİNCİ HADİSƏ ----- ۱۶

İŞARƏ ----- ۱۶

ANASI FATİMƏ İLƏ GÖRÜŞ ----- ۱۶

HAQQIN MÜDAFİƏSİ ----- ۱۷

SONUNCU GÖRÜŞ ----- ۱۸

ANASINDAN SONRA ----- ۱۸

ŞƏRİKLİ HƏYAT ----- ۲۰

ZEYNƏBİN HƏYAT YOLDAŞI ----- ۲۰

EV MÜHİTİNDƏ ----- ۲۱

ATA MƏKTƏBİNDƏ ----- ۲۴

SƏBR VƏ DÖZÜM ----- ۲۴

ƏDALƏT ----- ۲۵

ZÜLMLƏ MÜBARİZƏ ۲۶
ATA MÜSİBƏTİ ۲۷
İMAM HƏSƏN (Ə)-İN İMAMƏT DÖVRÜ ۲۸
İKİNCİ FƏSİL ۳۰
ŞƏHADƏT KARVANINDA ۳۰
YEZİD HÖKUMƏTİNİN BAŞLANMASI ۳۲
İMAMIN YEZİD QARŞISNDA MÖVQEYİ ۳۴
HİCRƏT ۳۴
MƏKKƏDƏn MƏDİNƏYƏ HİCRƏT ۳۵
GECƏ KARVANI ۳۶
HÜSEYNLƏ YANAŞI ۳۸
KARVANDA MƏSULİYYƏT ۳۹
MƏKKƏYƏ GİRİŞİ ۴۰
MÜSLÜM İBNİ ƏQİLƏ TAPŞIRIQ ۴۰
HƏRƏKAT QƏSDİ ۴۲
MÜSLÜMÜN QİYAMI VƏ İMAMIN HƏRƏKATI ۴۲
ÜMUMİ DƏVƏT ۴۲
ƏBDULLAH İBNİ CƏFƏRİN MƏKTUBU ۴۴
ACI XƏBƏR ۴۴
?ZEYNƏB NƏ EŞİTDİ ۴۶
KƏRBƏLA VƏ ƏBƏDİYYƏT ۴۶
KƏRBƏLAYA GİRİŞ ۴۸
ZƏRURƏTİN SÜBUTU ۴۸
!YEZİDLƏ BEYƏT? HEÇ ZAMAN ۵۰
DÜŞMƏN QARŞISINDA MÜQAVİMƏT ۵۰
TASUA GÜNÜ ۵۱

AŞURA GECƏSİNDƏ ZEYNƏB ŞƏFQƏTİ ---------- ۵۲
ZEYNƏB BƏNİ-HAŞİM MÜDRİKİ ---------- ۵۴
ZEYNƏBİ ÜZƏN XƏBƏR ---------- ۵۴
SEYYÜDÜŞ-ŞÜHƏDA MÜSİBƏTİNİN ƏZƏMƏTİ ---------- ۵۶
İMAMIN ZEYNƏBƏ TÖVSİYƏLƏRİ ---------- ۵۸
ZEYNƏBDƏN öYRƏNİLƏSİ DƏRS ---------- ۵۸
GECƏNİN QARANLIĞINDA ---------- ۶۰
ZEYNƏBİN İMAMLA SÖHBƏTİ ---------- ۶۰
SÜBH AÇILIR ---------- ۶۲
EŞQ NAMAZI ---------- ۶۳
İMAMIN SÖZÜ ---------- ۶۴
ÜÇÜNCÜ FƏSİL ---------- ۶۴
ZEYNƏB AŞURA HADİSƏLƏRİNDƏ ---------- ۶۴
ƏLİƏKBƏRİN CƏNAZƏSİNİN KƏNARINDA ---------- ۶۶
ZEYNƏB ÖVLADLARINDAN ŞƏHİD ---------- ۶۹
EŞQİN NÜMAYİŞİ ---------- ۷۰
ARAM VƏ DÖZÜMLÜ OLMAĞIN SİRRİ ---------- ۷۲
ƏHLİ-BEYTLƏ VİDA ---------- ۷۴
İMAMIN SON İSTƏYİ ---------- ۷۶
İMAMIN ŞƏHADƏTİ ---------- ۷۸
ZEYNƏBİN FƏRYADI VƏ DÜŞMƏNİN DAŞ QƏLBİ ---------- ۸۲
ÜRƏK AĞRIDAN XƏBƏR ---------- ۸۴
HADİSƏDƏN SONRA ---------- ۸۴
DÜŞMƏNİN QARƏT VƏ TALANI ---------- ۸۴
ƏZİZLƏRİNİN CƏSƏDİ KƏNARINDA ---------- ۸۶
İMAM SƏCCAD (Ə)-IN MÜDAFİƏSİ ---------- ۸۷

MƏNİ DƏ ONUNLA ÖLDÜRÜN ---------- ۸۸
İMAM SƏCCAD (Ə)-A TİBBİ YARDIM ---------- ۸۹
ZEYNƏBİN İMAMI SAKİTLƏŞDİRƏN SÖZLƏRİ ---------- ۹۲
DÖRDÜNCÜ FƏSİL ---------- ۹۲
TƏBLİĞAT KARVANINDA ---------- ۹۲
KUFƏYƏ DOĞRU ---------- ۹۵
KUFƏ VƏ KUFƏLİLƏR ---------- ۹۶
MİNBƏR ÜZƏRİNDƏ ---------- ۹۸
İBNİ ZİYADIN SARAYINDA ---------- ۱۰۱
ZEYNƏB MƏKTƏBİNDƏN DƏRSLƏR ---------- ۱۰۴
İMANIN ƏZƏMƏTİ ---------- ۱۰۴
GÖZƏL BAXIŞ ---------- ۱۰۴
İMAMI XİLAS ETMƏK ---------- ۱۰۶
ŞAMA DOĞRU ---------- ۱۰۷
YEZİDİN QARŞISINDA ---------- ۱۰۸
ƏBƏDİYYƏT DANIŞIĞI ---------- ۱۰۸
QORXMAZLIQ ZİRVƏSİ ---------- ۱۱۳
ZEYNƏBİN SÖZLƏRİNƏ BİR NEÇƏ İŞARƏ ---------- ۱۱۴
QARA QOVLUQ VƏ MURDARLIĞIN KÖKLƏRİ ---------- ۱۱۴
ALLAH VƏ ŞEYTAN DƏSTƏLƏRİ ---------- ۱۱۶
HİCAB VƏ İFFƏTİN QİYMƏTİ ---------- ۱۱۶
DÜZGÜN FİKİR ---------- ۱۱۶
ZEYNƏBİ-KUBRA VƏ BAŞQA BİR VƏZİFƏ ---------- ۱۱۶
BEŞİNCİ FƏSİL ---------- ۱۱۸
MƏDİNƏYƏ QAYIDIŞ ---------- ۱۱۸
MƏDİNƏYƏ DOĞRU ---------- ۱۱۹

# HƏZRƏT ZEYNƏBİN (S.Ə.) HƏYATI

## KİTAB HAQQINDA


Kitabın adı:......... Həzrət Zeynəbin (s.ə.) həyatı

Müəllif:................Məhəmmədi İştihardi

Tərcümə edən:............Vüsal Hüseynzadə və Maqsud Sayil

Nəşr edən:..................«Məhdiyyə» nəşriyyatı

Tiraj.........................................................٣٠٠٠

Çap növbəsi:................Birinci. ٢٠٠٠ Bahar

səh:١


## İşarə

ÖZ İLAHİ VƏZİFƏLƏRİNİ SƏBR VƏ MƏRDLİKLƏ YERİNƏ YETİRMƏKDƏ BÖYÜK KƏRBƏLA XANIMINA İQTİDA EDƏN, BÜTÜN ALLAH YOLU FƏDAİLƏRİNƏ TƏQDİM .OLUNUR

.Gözəllikdən başqa bir şey görmədim

(Həzrət Zeynəb (s

## BİRİNCİ FƏSİL

### VİLAYƏT ÇİÇƏYİ

Təvəllüd

Atanın zinəti

Səmavi ad

Peyğəmbər (s) ilə birlikdə

Ev mühitində

Ata məktəbində

Səbr və dözüm

Ədalət

Zülmlə mübarizə

Ata müsibəti

## İMAM HƏSƏN (Ə)–IN İMAMƏT DÖVRÜ

Varlıq dünyası bəşəriyyətə məna bağışlayan bir ailəyə borculudr. O ailə ki, bütün kainat onların qarşısında baş əyib təzim edir, mələklər onlara səcdə etməkdən çəkinmir və Cəbrəil Əlinin məclislərinə girmək üçün izn istəyir. O ailə ki, ilahi nemətlər .təcəssümü, Allahın cəlal və cəmal sifətlərinin aynasıdır

Onlar Peyğəbmər və onun Əhli-beytidirlər ki, Allah məxluqatın yaranma səbəbini onların varlığı ilə izah edib, buyurur: “Əzəmətli səma və geniş yerləri, işıqlı günəş, ay və ulduzları, axar dəniz və dəryaları siz Əhli-beyt üçün və sizin məhəbbətinizdən ötrü .yaratmışam

Onlar hər növ eyb və nöqsandan uzaq olan beş müqədds nurlar, vəhy xanədanı və .(vilayət ailəsidirlər – Peyğəmbər, Əli, Fatimə, Həsən, və Hüseyn (s

Belə bir ailədə bir qız uşağı dünyaya gəldi. Əzəmətli vilayət bağçasına mənsub olan bu çiçək, sonralar özünün Allah yolunda sədaqət və vəfası, şücaət və fədakarlığı, iman və təqvası, iffət və səbri, dözüm və mübarizəsi ilə bütün Allah yolçuları və xüsusilə, .özünün Əhli-beyt davamçısı hesab edən qadınlar üçün ülgü və nümunə olacaqdı

## TƏVƏLLÜD

Həzrət Əli (ə) və Fatimeyi-Zəhra (s)-ın Həsən, Hüseyn, Zeynəb, Ümmi Gülsüm və Möhsin adlı beş övladı olmuşdur. İmam Sadiq (ə)-dan rəvayət olunmuş hədisə əsasən həzrət Zəhranın son övladı olan Möhsin, İmamın düşmənlərinin o həzrətin evinə olan

təcavüzü nəticəsində anasının bətnində öldürüldü, xanım özü isə ağır yaralanaraq !şəhadətə yetişdi

Bu xanədanın üçüncü övladı Zeynəb Hicrətin ۶-cı ilində Mədinə şəhərində dünyaya göz .açdı

## ATANIN ZİNƏTİ

Zeynəb atanın zinəti deməkdir. Allah tərəfindən belə adlanan bu qız öz vəzifəsini yerinə yetirməklə tarixin zinəti və ailəsinin fəxri oldu. Odur ki, Zeynəb adı məhz

onun fədakarlığı hesabına həmişə gözəl, müqəddəs və əbədidir. Bu vilayət dürrünün :ad qoyma mərasimi haqda tarixdə belə oxuyuruq

## SƏMAVİ AD

Zeynəbi-Kubranın təvəllüdü zamanı həzrət Peyğəmbər (s) səfərdə olduğundan Fatimə Əlidən istədi ki, övladları üçün ad qoysun. Əli (ə) buyurdu: Mən atandan qabağa .keçmərəm. Səbr edək Peyğəmbər (s) səfərdən gəlsin

Peyğəmbər (s) səfərdən qayıtdıqdan sonra Əli (ə) Zəhranın uşağı olmasını xəbərini Peyğəmbərə çatdırıb, ondan uşaq üçün ad qoymasını xahiş etdi. Peyğəmbər (s) buyurdu: Fatimənin övladları mənim övladlarımdır, lakin onlar barəsində qərara .gəlmək yalnız Allaha məxsusdur

Ondan sonra Cəbrəil nazil olub xəbər gətirdi ki, Allah buyurur: Bu qızın adını Zeynəb qoy! çünki, Mən bu adı Lövhi-məhfuzda yazmışam. Bunu eşidən Peyğəmbər (s) Zeynəbi öpdü və buyurdu: Tövsiyə edirəm hamı bu qıza hörmət etsin. çünki, o, .Xədiceyi-Kubra kimidir

Yəni həzrət Xədicənin fədakarlıqları kimi, həzrət Zeynəbin Allah yolunda dözüm, səbr, .şücaət və mübarizəsi İslamın əbədiliyi üçün xüsusi əhəmiyyətə malikdir

## PEYĞƏMBƏR İLƏ BİRLİKDƏ

Həzrət Zeynəb beş ilə qədər Peyğəmbərlə bir zamanda yaşamışdır. Bu müddət onun Peyğəmbər (s) səhabələrindən hesab olunmasına kifayətdir və bu da bu barədə .yazılmış kitablarda qeyd olunmuşdur

Bu beş il fürsət idi ki, Həzrət Zeynəb Peyğəmbərin mübarək vücudundan səbr və dözüm hədisini yazsın. çünki, o, Zeynəbin həyat yolunun bütün müsibətlərindən xəbərdar idi və bilirdi ki, bu çətinliklərə yalnız böyük ruh, dağ kimi möhkəm qəlb və Allah eşqi ilə dolu ürək dözə bilər. Elə bil müsibət, çətinlik Zeynəbin taleyi ilə qarışmış və Allah-təala səbr və dözümü ondan cilvələndirmişdir ki, bütün Allah adamları üçün .nümunə olsun

## DƏRDLİ YUXU

Zeynəb, onu gözləyən qəmli macəraları uşaq vaxtında yuxuda görüb babası Peyğəmbərə (s) söyləyir. Peyğəmbər (s) onu gözləyən bu hadisələri təbir edir ki, Əlinin yetişdirməsi və Zəhranın qucağında böyümüş olan bu qız özünü həmin hadisələrlə görüşə hazır etsin. Bu yuxunu tarixdə belə oxuyuruq:

Peyğəmbərin (s) vəfatı yaxınlaşırdı. Bir gün Zeynəb onun yanına gəlib uşaqlara məxsus şirin dillə dedi:

Ey Peyğəmbər (s), bu gecə yuxuda gördüm ki, şiddətli bir külək əsib bütün dünyanı“ zülmətə qərq etdi. Mən küləyin şiddətindən o tərəf-bu tərəfə düşürdüm. Axırda məcbur qalıb böyük bir ağacdan yapışdım. Amma külək onu da yerindən qopardı. Mən ikinci dəfə onun bir budağından tutdum, amma o da davam gətirmədi. Üçüncü dəfə onun başqa bir budağından yapışdım, lakin külək onu da sındırdı. Sonra bir-birinə ”.yapışmış iki budağa üz tutdum ki, birdən onlar da sındı və mən yuxudan ayıldım

:Peyğəmbər Zeynəbin yuxusunu eşidəndən sonra ağlayıb buyurdu

Sənin ilk yapışdığın ağac babandır ki, teziliklə dünyadan gedəcək. Sonrakı iki budaq da“ ata və anandır ki, onlar da dünyadan gedəcəklər. Bir-birinə yapışmış iki budaq isə qardaşların Həsən və Hüseyndir ki, onların müsibətində dünya zülmətə qərq ”.olacaqdır

## BİRİNCİ HADİSƏ

### İŞARƏ

Çox keçmədi ki, Zeynəbin yuxusunun bir hissəsi çin çıxdı və istəkli babasının vəfatı ilə o, ilk pənahını əldən verdi. Bu, onun lətif və riqqətli qəlbini incidən ilk müsibət və sanki bir başlanğıc idi. Hələ bilmirdi ki, qarşıda hansı müsibət və bəlalar onu gözləyir. Amma bəşər tarixinin bu yenilməz siması heç vaxt həyatın ağrıları qarşısında baş əyməyəcək, .mətanətlə islamın qorunması üçün öz vəzifəsini yerinə yetirəcəkdir

### ANASI FATİMƏ İLƏ GÖRÜŞ

Həzrəti Fatimə (s) atasından bir müddət sonra dünyasını dəyişdi. Buna əsasən, Zeynəb .Zəhra kimi bir ananın məhəbbətindən yalnız bir neçə ilə bəhrələndi

Bir neçə illik bu qısa müddət Zeynəbi Allah yolunda müsibət və çətinliklərə, cihad və mübarizəyə hazırlayan xatirələrlə doludur. Zeynəb Peyğəmbərin vəfatından sonra anası Fatiməni gülən və hətta təbəssüm edən halda da görmədi. Fatimə atasının ayrılığına o qədər ağlayıb ki, onun adını tarixin Adəm, Yəqub, Yusif və imam Səccad (ə) .kimi ən çox ağlayanların sırasında qeyd etmişlər

Zeynəb bütün bu vaxt ərzində anasının yanında olmuşdur. O, babasının müsibətli vəfat

səhnələrini, anasının qəm-qüssələrini və düşmənlərin Əhli-beyt haqqında olan cinayətlərini görürdü. Bu mənfi hallar onun kiçik qəlbini incidir, o isə səbr edib dözür və sanki daha böyük müsibətlərə hazırlaşırdı.

## HAQQIN MÜDAFİƏSİ

Zeynəb anası Fatimənin Peyğəmbər məscidində Fədək və Əhli-beytin müdafiə mövzusunda etdiyi çıxışda iştirak edirdi. O, anasının xütbəsini dinləməklə yanaşı, zülm qarşısında necə mövqe tutmaq yolunu da öyrənirdi.

O, anasından öyrəndi ki, düşmənlə necə mübarizə etmək və onu rüsvay etmək olar. O, hazırlaşırdı ki, Kufə bazarında, İbn Ziyad və Yezidin saraylarında öz sözləri ilə onların .cinayətlərini ifşa edib İslam və Əhli-beyt vilayətini müdafiə etsin

## SONUNCU GÖRÜŞ

Nəhayət, ana ilə son görüş və vidalaşma zamanı çatmışdır. Zəhranın pak ruhu mələkut aləminə pərvaz edib, cismi isə qüsl olunub kəfənlənmişdir. Atanın göstərişi ilə Zəhranın balaları ana ilə vidalaşır, son dəfə onu qucaqlayıb ayrılırlar. Həzrət Əli (ə) bu qəmli :səhnələri belə təsvir edir

Zəhranın kəfənini düyünləyərək Ümmü Gülsüm, Zeynəb, Həsən və Hüseynə dedim:" Gəlin son dəfə ananızla görüşün ki, bu ayrılığın başlanğıcıdır. növbəti görüş isə behiştdə olacaqdır. Həsən və Hüseyn anaları tərəfə gələ-gələ bu sözləri deyirdilər: Babamız Peyğəmbər (s) anamız Fatimənin (ə) ölmündə olan qəm və həsrət yanğısı heç vaxt sönməyəcək. Ana can! Bizim salamamızı babamız Məhəmməd Mustəfaya (s) ."çatdır və de ki, səndən sonra biz dünyada yetim qaldıq

Əli (ə) buyurur: "O zaman göydən bir səs eşitdim ki, deyirdi: Ey Əbul-Həsən, onları ".anasının qucağından götür. Bu iki uşaq göyün mələklərini ağlamağa məcbur etdilər

.Beləliklə, Zeynəb körpə yaşlarında mehriban ana və səmimi dostunu itirdi

## ANASINDAN SONRA

Artıq Əli evi Fatimə vücudunun şamı ilə nurlanmırdı. Buna görə də uşaqları öhdəsinə götürən bir qadına ehtiyac var idi. Fatimə (ə) bu əhəmiyyətli işi ömrünün son günlərində duymuş, uşaqları üçün mehriban ana və Əli üçün vəfalı yoldaş tapıb onunla evlənməyi Əli (ə)-a tövsiyə etmişdi. Bu şərəf həzrət Zəhranın ögey bacısı "Əmaməyə" .mənsub idi

Zeynəb anasından sonra Əli kimi atanın tərbiyəsi sayəsində, Həsən və Hüseyn kimi qardaşlarla yanaşı böyüyüb yetkinləşir və elə uşaqlıqdan çoxlu çətinlik və ruhi .sıxıntılara dözüb tərcrübə toplayır

Zeynəb Həsən və Hüseyndən kiçik olamasına baxmayaraq, Fatimə qızı və onun yetişdirməsi olduğu üçün qardaşları ilə onun arasında vəsfəgəlməz məhəbbət və bağlılıq olmuşdur. Bu məhəbbətin nəticəsində də o, bir an da qardaşlarından ayrılmır və onların qüssələrinə dözə bilmirdi. necə ki, görəcəyik o, ömürünün sonuna qədər .mehriban ana kimi onları sevir və qəmlərinə şərik olurdu

səh:۵

## ŞƏRİKLİ HƏYAT

Artıq Zeynəbin ailə qurmaq vaxtı yaxınlaşmışdır. O bilir ki, izdivac hər bir insan üçün təbii və şəri vəzifədir və bu sünnətdən imtina etmək Peyğəmbərin (s) dinindən çıxmaq .deməkdir

Lakin Zeynəb izdivac etməklə boynunda olan böyük vəzifəni unutmur. O bilir ki, hər an və bütün səhnələrdə qardaşının yanında olmalıdır. O bilir ki, əzizlərinin qiyamının səmərəsi onun əsir düşməsi, səbr edib dözməsi, qiyamın mahiyyət və səbəblərini .bəşəriyyət tarixinə yetirməsindən asılıdır

Bu səbəbdən Zeynəb izdivac ərəfəsində də vəzifəsini unutmur və ailə qurmaq üçün imam Hüseynlə (ə) birgə olmağı şərt kəsir. Əli (ə) qızına elçi göndərən və Əhli-beyt dostlarından olan Əbdüllah ibni Cəfər sözsüz ki, bu şərti qəbul edir və nəhayət .Zeynəbi-Kübranın əri olmaq şərəfinə nail olur

## ZEYNƏBİN HƏYAT YOLDAŞI

Əbdüllah Cəfərin övladlarındandır. Cəfər isə Əbu Talibin oğlu, Əlinin (ə) qardaşı, Mutə döyüşünün fədaisi və İslamın böyük şəhidlərindəndir. Cəfəri-Təyyar adı ilə məşhur olan bu insanın şəxsiyyətini Peyğəmbərin (s) sözləri və ona bağlılığı ilə müəyyən etmək olar. Yəhudilərin Xeybər qalasının fəthi və Cəfərin Həbəşədən qayıtdığı zaman Peyğəmbər (s) onu qucaqladı və alınını öpüb buyurdu: "Bilmirəm hansı iş üçün sevinim. Xeybərin alınması, ya Cəfərin gəlişi üçün?" Sonra Peyğəmbər (s) ona məscidin .qonşuluğunda mənzil verdi

Mutə döyüşündə Cəfərin iki qolu da kəsiləndən sonra bayrağı yerə atmağa razı olmayıb onu dişlərinə aldı. Həzrət Peyğəmbər (s) bu barədə buyurmuşdur: "Allah Cəfərin iki qolunun yerinə ona iki qanad verəcək ki, behiştdə onlarla pərvaz etsin." .Buna görə də ona Cəfəri-Təyyar (uçan) deyiblər

Əbdüllah Həbəşədə doğuldu. Bu o zaman baş verdi ki. Cəfər öz həyat yoldaşı və bir dəstə müsəlmanla birgə düşmənlərin təzyiqi nəticəsində, Peyğəmbərin (s) təklifi ilə .həbəşəyə hicrət etmişdilər

Əbdüllahın atası Cəfərin şəhadətindən sonra Peyğəmbər (s) onun uşaqlarını yanına gətirib bir ata məhəbbəti ilə qucağına alar, öpüb ağlayar, beləliklə sanki Əbdüllaha və .başqa balalara təsəlli verərdi

Peyğəmbərdən sonra Əbdullah Həzrətin (ə) yanında rəşadət və fədakarlıqlar göstərmiş, Süffeyn döyşündə isə döyüş səhnəsinin xüsusi qəhrəmanlarından hesab .olunmuşdur. O zamanlar o, səxavət və əliaçıqlıqda da məşhur idi

## EV MÜHİTİNDƏ

Heç şübhəsiz, insan tərbiyəsinin ən mühüm dövrü və şəxsiyyətin formalaşma zamanı uşaqlıq çağıdır. Bu dövr də başqa dövrlərə nisbətən insanı əhatə edən təbii və

ictimai mühit daha təsirli olub, onun formalaşmasında mühüm rol oynayır. Ata-ananın əməl, rəftar, münasibət və ümumiyyətlə bütün hərəkətləri, eləcə də onların bir-birləri və digərləri ilə davranış tərzləri uşağın əxlaq, ruhiyyə və xasiyyətinə bir-başa təsir .göstərib, incə və həssas qəlbini öz təsiri altına alır

Ata və ana böyütdükləri uşaq vasitəsi ilə öz hərəkət və rəftarlarının yaxşı və pisliyini müəyyən edə bilərlər. Bu mənada uşaq onlar üçün güzgü rolunu oynayır və uşağın .xarakter və xüsusiyyətləri onların əxlaqının xülasəsi hesab olunur

Uşaqlarda olan bu əks təsirə görə onların tərbiyəsi, eləcə də fikri, əxlaqi və ideoloji inkişafı sahəsində çoxlu tövsiyələr olmuşdur. Bu tərbiyələrin təsiri o həddə qədərdir ki, Əli (ə) uşaq qəlbini istənilən toxumu qəbul etməyə hazır olan boş və əkilməmiş torpağa .bənzədir

Buna görə də uşağın şəxsiyyət və gələcəyini ata və ananın əməli tərbiyələrindən asılı .hesab etmək olar

Lakin Zeynəb elə bir nümunəvi ailədə böyüyüb boy atmışdır ki, tarix belə böyük əzəmətli ailənin şahidi olmayıb və olmayacaq da. Zeynəbin şəxsiyyəti elə bir evdə formalaşdı ki, onda iman nuru parlayırdı, səfa-səmimiyyət, eşq və mənəviyyət dolu idi. Bir ev ki, Əli kimi atası, Fatimə kimi anası vardı. Bu məsum ata və ananın nəfsani və şeytani istəkləri onlara tabe idi və bütün duyğu və istəklər, iş və hərəkətlər yalnız ilahi vəzifəni yerinə yetirməyə xidmət edərdi. Onlar Allahın razılığından başqa bir şey .düşünmür, islamın inkişafı və bəşəriyyətin nicatı üçün hərəkət edirdilər

Zeynəb bu mühitdə və belə bir ata-anasının təsiri altında böyüyür, belə bir məktəbdə ilahi elmləri və islami qaydaları öyrənir, dini tərbiyə və əxlaqi fəzilətlər əldə edib .kamilləşirdi

Beləliklə Həzrət Zeynəb ailə, evdarlıq, uşaq tərbiyəsi, məişət idarəsi və ümumiyyətlə davranış qaydalarını anasından öyrənmişdi ki, gələcəkdə ərinin evində anası kimi öz .vəzifəsinin icra etsin

O, anasının evdə sabitlik, mehribanlıq, səmimiyyət və mənəviyyət yaratmaq üçün

necə çalışdığını görürdü. O, atasının bu sözlərini eşitmişdi: “Həmişə evə gəlib Zəhraya .”baxanda qəm-qüssələrim yaddan çıxırdı. O, heç vaxt məni qəzəbləndirmədi

Zeynəb yoldaşlıq və səmimiyyət nümunəsinin öz mehriban ata-anasının timsalında görmüşdü. O, anasının evdarlıq zəhmətlərini və qabarlı əllərini görmüş, ev işlərinin .Allah yanındakı əcr və savabına vaqif olmuşdu

O, evdə birlik və həmkarlığı ata-anasından öyrənmiş, atasının çırpı və su gətirdiyini, anasının xəmir hazırlayıb çörək bişirdiyini görmüşdü. O bilirdi ki, qadının cihadı ərinin .qulluğunda durub yaxşı evdarlıq etməkdir

Zeynəb anasının övladlarına olan məhəbbətini unutmur, bunu öz həyatının ən şirin .xatirələrindən hesab edirdi

O, anasının Peyğəmbər məscidindəki çıxışından dindarlıq, şücaət və islami dəyərləri .qorumaq dərsi alıb bu yolda fəaliyyət və mübarizəni özünə vacib bilirdi

səh:٧

Beləliklə, Zeynəbi-Kubra vilayət evində böyüdü, onun şəxsiyyəti bu tərbiyələr sayəsində formalaşdı. Onu, ata-anasından öyrəndiyi əxlaq, tərbiyə, mərifət və insani fəzilətlər simvolu hesab etmək olar. O, indi ailə quraraq ər evinə gedir, sonralar isə bu müqəddəs səngərdə nümunə olaraq öz vəzifəsini yerinə yetirib, İslam üçün mübariz .övladlar tərbiyə edəcəkdi

## ATA MƏKTƏBİNDƏ

Həzrət Əlinin (ə) şəhadətində Zeynəbin təqribən ٣٥ yaşı var idi. O, şübhəsiz atasının həyat tərzindən, əxlaqi və siyasi görüşlərindən bəhrələnmişdi. Onun atası ilə bağlı çoxlu xatirələri var idi. Bu acı və şirin xatirələr onun bir şəxsiyyət kimi .formalaşmasında öz dərin təsirini buraxmışdı

## SƏBR VƏ DÖZÜM

O, atasının məzlumiyyət günlərinin şahidi idi. O, Peyğəmbərdən (s) sonra atası ilə necə rəftar edildiyini, onun təyin olunduğu vilayətin necə qəsb olunub haqqı tapdalandığını yaxşı xatırlayırdı. Zalımlar xilafət başında oturub özlərini Peyğəmbərin (s) canişini adlandırdıqları halda, Əli (ə) İslamın qorunması və müsəlmanların məsləhətindən başqa bir şey düşünmür, iyirmi beş il səbr etməklə Allahın razılığını hər şeydən üstün .tuturdu

Bu dövrdə Zeynəb hadisələri diqqətlə izləyir, bir növ təcrübə toplayırdı. çoxlarının mənsəbpərəstlik və həvəsbazlığını görüb, dostla düşməni tanıyır, Əbu Süfyan və Müaviyələrin iyrənc əməllərini və siyasi hoqqabazlıqlarını görür, zahirdə İslam libasına bürünüb, döşünə Allah nişanı taxan, əslində isə İslam və Əhli-beyti məhv etmək üçün .plan cızıb həqiqəti əksinə göstərən mənfur sifətlərinin şahidi olurdu

Zeynəb bütün bu haqsızlıqları görüb, atasının səbrinin böyüklüyünü anlayırdı. Atası belə demişdi: “Mən gözündə çöp, boğazında sümük qalmış bir adam kimi səbr edib .dözdüm

Zeynəb onun səbrindən ilham alıb fədakarlıq dərsini öyrənirdi. öyrənirdi ki, necə Allah yolunda əzab və məhrumiyyətlərə dözüb şəxsi mənafeyini ilahi və islami mənafelərə .qurban verməlidir

## ƏDALƏT

İyirmi beş illik sükut və məzlumiyyət dövrü sona çatmışdır. Haqq və ədalətdən savayı fikri olmayan Əli (ə) camaatın təkidi ilə xilafət kürsüsünə əyləşib ümmətə rəhbərlik edirdi. Əlinin (ə) beş illik xilafəti Zeynəb üçün çox mühüm və maraqlı olmuşdur. Ədalətin bərqərar olduğu o dövrdə Əliyə müraciət edən, rəyasət və məqam eşqi ilə yanan dünyapərəstlərin çoxu onun qatı düşmənlərindən oldular. Onlar həzrət Əlinin (ə) buyurduğu bu ədalətli kəlamı eşitməyə qadir deyildilər:

səh:۸

And olsun Allaha! Osmanın haqsız olaraq müsəlmanların beytül-malından bağışladığı“ bütün hədiyyələri geri alacağam, hətta bu vəsaitlə izdivac etmiş və ya kəniz almış .”olsalar belə

Onlar gördülər ki, Əli (ə) yoxsulluq ucbatından beytül-mala göz dikən qardaşı Əqilin bədəninə isti dəmiri yaxınlaşdırdı və onun naləsi qarşısında buyurdu: “Vay olsun sənə, Əqil! İnsanın qızdırdığı adi dəmirdən nalə edirsən, amma məni qəhhar Allahın öz qəzəbi ilə odladığı atəşə çəkirsən. Sən bundan nalə etdiyin halda, mən Cəhənnəm ”?odundan qorxmayım

Həzrətin beytul-maldan bir boyunbağı əmanət almış qızına «Əgər bu boyunbağını beytül-maldan əmanət şəklində almasaydın oğurluq üstündə əli kəsilən ilk Haşimi .qadın olacaqdın» - deyə buyurması onların xam-xəyalını alt-üst edirdi

## ZÜLMLƏ MÜBARİZƏ

Əlinin (ə) hakimiyyət dövrü düşmənlərlə döyüş və mübarizədə keçmişdir. Onlar öz maddi məqsədlərinə çatmaq üçün avam və həris insanlardan məharətlə istifadə edirdilər. Əlinin (ə) qarşısında Müaviyə kimi təhlükəli və hiyləgər düşmənlər dururdu. Bu rəzil insanlar öz məqsədləri naminə bütün vasitələrdən istifadə edirdilər. Əli (ə) istər bu zəhərli ünsür, istər dünya eşqi ilə yanan və Peyğəmbərin həyat yoldaşı Aişədən istifadə edən Cəməl süvariləri (Təlhə və Zübeyr) və istərsə də təqva adı altında onunla düşmənçilik edən, qətlini vacib bilən avam və yazıq Xəvaric dəstəsi ilə .mübarizədən başqa bir yol görmürdü

Zeynəb Peyğəmbərdən sonra baş verən qəmli hadisələri müşahidə edib ondan dərs alır, öz ictimai-siyasi və tarixi görüşünü artırır, atasının tükənməz fəzilətləri, ibadət və şücaətindən ilham alırdı. O atasının məktəbində öyrəndiklərinin hamısını Kərbəla, Kufə, Şam kimi böyük səhnələrdə nümayiş etdirib, öz ibadət və tədbiri, səbr və şücaəti ilə bir daha Əli qızı olduğunu sübut etdi. Elə bir Əli ki, bütün ömrünü Allah və Onun razılığı yolunda sərf edib, malik olduğu böyük qüdrətlə yanaşı səbr edib, şücaətlə düşmənini məğlub edərək ədalətə rəvac verib və nəhayət, hər şeyini öz sevgili .rəbbinə qurban etmişdir

## ATA MÜSİBƏTİ

Hicrətin ۴۰-cı ili Ramazan ayının ۱۹-cu gecəsi müdhiş bir səda Kufə şəhərinin bütün .fəzasının bürüdü: “Ədalət və düzlük imamı Əli (ə) ibadət mehrabında qətlə yetirilmişdir

Kufə şiələri nigaran halda özlərini imama çatdırıb halını bilmək istəyirdilər. Zeynəb isə, .o həzrətin başqa övladları kimi atasının yanında idi

O, özünü atasına necə çatdırmışdı? Onun yaralı başını, qanlı üzünü gördükdə nə etmişdi? Bu sualların cavabı dəqiq məlum deyil. Amma onun ürək ağrıdan oxşamaları və üzücü nalələri bu müsibətdən necə təsirləndiyindən xəbər verir. Daş

ürəkləri əridən, həzrətin dostlarını əldən salan bu hadisə, gör Zeynəb kimi bir qızın incə .və lətif qəlbinə nə edəcəkdi

Əlinin (ə) şəhadəti və onun kimi bir atadan ayrılmaq Zeynəbə çox ağırdır. O, babası Peyğəmbərin ölümü və anası Fatimənin şəhadətindən sonra atasına daha çox bağlanmışdı. Belə bir atanın sayəsi onun qəlbinə sükunət və sərinlik gətirirdi. Amma, indi o, bu ocaqdan da məhrum olub öz dərdləri üstünə bir dərd də əlavə etməliydi. O isə, bu atanın məktəbində tərbiyə aldığından yalnız Allahın razılığını düşünüb, səbr .edirdi

## İMAM HƏSƏN (Ə)–İN İMAMƏT DÖVRÜ

İmam Həsənin (ə) imamət dövründə xalqın vəziyyətini təsəvvür etmək üçün Əlinin Kufə əhli barəsində fikirlərinə diqqət etmək kifayətdir. çünki, ondan qabaq bu xalqın rəhbər və hakimi o Həzrət olmuşdur. Bu xalq Əlinin (ə) təbiri ilə desək ağıl və şüur cəhətdən uşaq kimi, vəfasızlıqda elə bir səviyyədədirlər ki, həzrət özü «kaş onları .görməyəydim» deyə arzu edir

İmam Həsən Müctəba (ə) belə bir xalq və belə bir ruhiyyələrlə üzləşmişdir və təbii ki, bu xalqla işləmək, onlarla düşmənə qarşı mübarizə aparmaq faydasızdır. Onlardan gözləmək olar ki, imamın ayağı altından səccadəni çəkib, özünü təhqir etsinlər və ya .onu öldürməyə çalışıb, qılıncla yaralasınlar

Zeynəb qardaşı Müctəbanın imaməti dövründə də atasının məzlumiyyəti günlərində olduğu kimi xalqın vəfasızlığı, düşmənlərin hiyləsi, Müaviyənin dəqiq və geniş təbliğatı və nəhayət qardaşının məzlumiyyət və tənhalığından başqa bir şey görmədi. O, öz zaman mühitini yaxşı tanıyır və bilirdi ki, zalım əleyhinə qiyam etmək məsum imam ünvanında kamil insan və saleh bir bəndənin rəhbərliyi ilə yanaşı, vəfalı və müti bir .xalqa da möhtacdır

O, şahid oldu ki, Əhli-beytin müdafiə iddiaçıları çətinlik və imtahan zamanı zəiflik göstərir, dini və mənəvi dəyərləri fani dünyaya satıb məsum və ilahi rəhbərlərini öz şeytani arzularına qurban edirlər. Zeynəb dost və düşməni tanıyır, imamının istəklərini .icra etməkdən başqa bir şey düşünmürdü

Zeynəb bu müddətdə özünü qardaşı imam Həsənin (ə) bütün dərdlərinə şərik bilir, zəhərlənərkən necə ciyar qanı içdiyinin şahidi olur, onun məzlumanə şəhadətini, cənazəsinin oxlanaraq təhqir olunmasını öz gözü ilə görürdü. Nə qəmli yaşlar axdı !!!gözündən və nə dağlar çəkildi onun dağlı qəlbinə

Bu dərd və müsibətlərin, qəm və qüssələrin əzəmət və böyüklüyünü Zeynəb Aşura gecəsi dilinə gətirdi. Qardaşı imam Hüseynin (ə) oxuduğu şerlərdən onların da şəhadətini duyaraq fəryad etdi. «Həzər bu müsibətdən kaş ölüm həyatıma son qoyaydı. Bu gün, anam Fatimə, atam Əli və qardaşım Həsənin dünyadan gedən .«günlərinə bənzəyir

Bəli, bütün bu müsibətlərdə Zeynəbin şüarı həmən Seyyidüş-şühədanın şüarıdır ki, :Kərbəlanın ağır müsibət dalğalarında dodaqaltı zümzümə edirdi

.«Səbrən əla qəzaikə, la ilahə sivakə, ya ğiyasəl mustəğisin...»

Sənin qəza və qədərinə səbr edirəm, İlahi! Səndən başqa Allah yoxdur. Ey kömək“ ”!istəyənlərin fəryadına çatan

## İKİNCİ FƏSİL

## ŞƏHADƏT KARVANINDA


Şəhadət karvanında

Yezid hökumətinin başlanması

İmamın Yezidin qarşısında mövqeyi

Hicrət

Məkkədən Mədinəyə hicrət

Gecə karvanı

Hüseynlə yanaşı

Karvanda məsuliyyət

Məkkəyə giriş

Müslim ibni Əqilə tapşırıq

Hərəkat qəsdi

Müslümün qiyamı və İmamın hərəkatı

Ümumi dəvət

Əbdullah ibni Cəfərin məktubu

Acı xəbər

?Zeynəb nə eşitdi

Kərbəla və əbədiyyət

Kərbəlaya giriş

Zərurətin sübutu

!Yezidlə beyət heç zaman

Düşmən qarşısında müqavimət

Tasua günü

Aşura gecəsində Zeynəb şəfqəti

Zeynəb Bəni-haşim müdriki

Zeynəbi üzən xəbər

Seyyidüş-şühəda müsibətinin əzəməti

İmamın Zeynəbə tövsiyələri

Zeynəbdən öyrəniləsi dərs

səh:۱۱

Gecənin qaranlığında

Zeynəbin İmamla söhbəti

Sübh açılır

Eşq namazı

İmamın sözü

Həzrət Zeynəb həyatının ən mühüm və əzəmətli dövrü imam Hüseynin (ə) dövrünə, eşq və şəhadət karvanı ilə yoldaşlıq etdiyi zamana təsadüf edir. Həzrət Zeynəbin təvəllüddən imam Hüseynin (ə) hərəkatına qədərki həyatının tarixdə qeyd olunmasına baxmayaraq, bu dövrə aid olan bəzi nöqtələr qaranlıq qalmışdır. Lakin onun həyatının son illəri, yəni imam Hüseynlə (ə) birgə mübarizədən sonrakı dövr aydın surətdə qeyd olunmuş, özünə məxsus əzəmət və cəlalı ilə nəzərə çarpmışdır. Sanki, imam Hüseynin (ə) qiyamını Zeynəbsiz və Zeynəbi qiyamsız təsəvvür etmək mümkün deyil. çünki, imam Hüseyn (ə) qiyamının hər tərəfli təhlili üçün Zeynəbi öyrənmək lazımdır və əgər belə demək mümkünsə, Zeynəb Seyyidüş-şühəda hərəkatının canlı tarixi, ölməz .natiqidir

Zeynəb Kərbəla tarixi ilə hərəkətdədir və bu tarixin bütün hadisələrinin Zeynəblə sıx əlaqəsi vardır. Bu səbəbdən Zeynəbin həyat tarixini Kərbəlasız təsəvvür etmək .mümkün deyil

Zeynəb imam Hüseyn (ə) hərəkatının bütün səhnələrində nəzərə çarpır. Bu əsasla demək olar ki, Kərbəla hadisəsi imam Hüseyn (ə) həyatının böyük bir hissəsini təşkil .etdiyi kimi, həzrət Zeynəb həyatının da izzət və əzəmətli dövrünə təsadüf edir

Həzrət Zeynəbin tarixinin Kərbəla tarixi ilə sıx bağlılığını nəzərə alaraq imam Hüseyn (ə)-ın əzəmətli və əbədi hərəkatının xülasəsini bəyan edir, Zeynəbin böyük vəzifəsi, :habelə şücaət və fədakarlığı ilə daha yaxşı tanış oluruq

### YEZİD HÖKUMƏTİNİN BAŞLANMASI

Müaviyənin ölümü ilə onun ٢٠ illik alçaq və rəzil hökuməti dövrü sona çatdı. O, bu ٢٠ il

ərzində xalqın ürəyinə elə qorxu və vəlvələ salmışdı ki, heç kim Peyğəmbər Əhli-.beytindən danışmır, onları müdafiə edə bilmirdi

Onun hökuməti illərində şiələrin vəziyyəti olduqca ağır idi. Müaviyə ya onları öldürür, ya həbs edir və ya vətənlərindən didərgin salırdı. Həzrət Əli (ə) və Əhli-beytin fəzilətləri barəsində hədis deyənlərin təqib olunacağını isə rəsmi surətdə elan .olunmuşdu

O, Əhli-beyt əleyhinə hər növ fitnə və fəsaddan istifadə edirdi. Onlara qarşı təbliğat və şayiələr elə bir həddə idi ki, Şam əhli həzrət Əli (ə)-ın namaz mehrabında şəhid ?olmasını eşidəndə təəccüblə soruşurdular: Məgər Əli namaz qılardı

Müaviyə bu mühiti oğlu Yezidin hakimiyyətə gəlməsi üçün hazırlamışdı. Heç kəsin onun qarşısında etiraz etmək iqtidarında olmadığını oğluna söyləmiş, yalnız imam Hüseyn .(ə) tərəfindən təhlükə gözlədiyini ona xatırlatmışdı

Yezid belə bir vəziyyətdə hökumətə çatdı və ilk növbədə atasının hökumət .nümayəndəsinə məktub yazıb imam Hüseyndən onun üçün beyət almasını əmr etdi

## İMAMIN YEZİD QARŞISNDA MÖVQEYİ

İmam Hüseyn (ə) bilirdi ki, xalqın Əhli-beytə meyli var və onun Yezidlə beyəti bütün .müsəlmanların onunla beyəti deməkdir

İmam (ə) Yezid hökumətini qeyri-şəri və fasiq bilirdi. Bunun üçün də Mədinə hakiminə cavabında buyurdu: "Biz kəramət Əhli-beyti və risalət xəzinəsiyik... Mən babam Rəsulullahdan eşitdim ki, buyurdu: "Əbu Süfyan övladlarına xilafət haramdır," belə .olan halda mən bu sülalə ilə necə beyət edə bilərəm

Bu hadisədən sonra Mədinə hakimi Yezidə cavabında yazdı: Hüseyn ibni Əli səni ?xilafətə layiq bilmir və səninlə beyət etmək fikri də yoxdur. Əmrin nədir

Yezid cavab yazdı ki, məktubu alan kimi dərhal mənim müvafiq və müxaliflərimi .müəyyən edib, Hüseyn ibni Əlinin başı ilə birgə mənə göndər

## HİCRƏT

Hicrət kəlməsi gözəl bir ifadə olub, Quranda "iman" və "cihad" kəlməsi ilə yanaşı .işlənilmişdir

Əgər İslamın tərəqqi amillərindən biri də həmin hicrət olub desək yanılmarıq. Peyğəmbərin təklifi ilə bəzi müsəlmanların Məkkədən Həbəşəyə və Peyğəmbər və müsəlmanların Məkkədən Mədinəyə ümumi hicrəti çoxlu əsər və bərəkətlərin mənşəyi .olmuşdur

Peyğəmbərin hicrəti islam və müsəlmanlar üçün ciddi dəyişiklik yaradıb, onun ilkin islam hökumətinin bərqərar etməsinə zəminə yaratdı. Sonra isə müsəlmanların mübarizə və fədakarlığı ilə islamın izzət və əzəməti gün-gündən artdı və beləliklə, hicrət müsəlmanların tarix başlanğıcı hesab olundu. Bu elə bir hicrət idi ki, islam hökumətinin möhkəm sütunlarını bərpa etdi və onun vasitəsi ilə islam ayaq tutub .yeriməyə başladı

Lakin, islam tarixində bir hicrətlə də rastlaşırıq ki, Mədinədən Məkkəyə olmuşdur. Böyük bir hicrət ki, onun əsası islam dini və Peyğəmbərin ali məqsədlərini qorumaq idi. Qanlı-qadalı bir hicrət ki, imam Hüseyn (ə) öz Əhli-beyti və yoldaşları ilə dini heysiyyət .və Peyğəmbərin zəhmətinin nəticələrini qorumaq üçün başladı

Həzrət Mədinədən çıxarkən qardaşı Məhəmməd Hənəfiyyəyə yazdığı .vəsiyyətnaməsində öz hicrətinin məqsədini belə bəyan edir

Mən istirahət və rahatlıq, zülm və ədalətsizlik, təkəbbür və ya fəsad xatirinə“ Mədinədən çıxmıram. Mənim məqsədim cəddim Peyğəmbər ümmətini islah etməkdir. Mən istəyirəm yaxşılıqa dəvət edib pislikdən çəkindirəm, babam Peyğəmbər və atam .Əli ibni Əbi Talibin yolu ilə gedəm

## GECƏ KARVANI

Hicrətin ۶۰-cı ili, Şəban ayının üçüdür. Qaranlıq öz kölgəsini Peyğəmbər şəhəri Mədinəyə salmışdır. Gecə qaranlığı, zülm və istibdad qaranlığı, cəhalət və nadanlıq qaranlığı. İmam qaranlıqları sevməz. Bu gecə imam Hüseyn (ə) onları nura çevirmək .niyyətindədir

Mədinə daha Hüseynin (ə) yeri deyil. Mədinədə qalmaq məhv olmaq, islam düşüncəsinin, Peyğəmbər və Əli zəhmətlərinin əldən çıxması deməkdir. İmam isə din keşikçisidir. Bu səbəbdən buradan getmək, hicrət etməkdən başqa çıxış yolu görmür. .Gecənin qaranlığında düşmənlərin gözündən uzaq, camaatın xəbəri olmadan

O, elə bir şəhərlə vidalaşmalı idi ki, yaxın keçmişində əziz babasının şanlı hökumət mərkəzi, vəhy əmanətçisi Cəbrəilin və Quranın nazil olduğu yer olmuşdur. O Mədinə ki, ۵۶ il qabaq, yəni Hicrətin ۴-cü ilində orada dünyaya gəlmiş və mələklər onun bələyindən təbərrük etmişdilər. O Mədinə ki, illərlə orada ona xüsusi əzəmət və .gözəllik bəxş etmişdi

O dövrdən çox keçirdi. Xalq Əhli-beytin əzəmətini Peyğəmbərin onlarla rəftarında müşahidə etmişdi. Peyğəmbərin öz qızı Fatimənin əlini necə öpdüyünü, balaca Hüseyni qucağına alıb öpərək öz çiyinlərinə çıxardığını hələ unutmamışdılar. Elə həmən bu :Mədinədə Təthir ayəsi nazil oldu

.«İnnəma yuridullahu liyuzhibə ənkumur-ricsə əhləl bəyti və yutəhhirəkum təthirən»

Həmən Mədinədə ki, Əhli-beytin əzəmət və isarı «Həl-əta» surəsi nazil oldu. Həmin Mədinədə idi ki, Peyğəmbər dəfələrlə Əhli-beyt barəsində xalqa tövsiyə etmiş, onların :itaət və yoldaşlığını vacib buyurmuşdu. Elə həmin Mədinədə Peyğəmbər buyurdu

.«Əl Həsənu vəl Huseynu seyyida şəbabi əhlil cənnəti»

Həsən və Hüseyn behişt cavanlarının ağalarıdır. Həmin Mədinədə Peyğəmbər :buyurdu

.«Əhəbəllahu mən əhəbbə Huseynən»

”.Hüseyni sevəni Allah sevər“

Bu gün isə Hüseynin Mədinədə qalmağa yeri yoxdur. Mədinənin qapı-pəncərələri, küçə və dalanları, yeri, göyü və hətta daşları da ağlayaraq onun karvanını yola salırdı. Onların hamısı onun babası, atası, anası, qardaşı, özü və ailəsindən yalnız lütf və .mərhəmət görüblər

İmam Hüseyn (ə) Allah kəlamını züm-zümə edərək, Musa peyğəmbər, Fironun zülmündən qurtarmaq üçün Məkkəyə tərəf hərəkət edərkən oxuduğu sözlərdən ibarət olan ayəni oxuya-oxuya babası Peyğəmbər (s) və anası Fatimənin (ə) .məqbərəsi ilə vidalaşıb öz hicrətinə başladı

**HÜSEYNLƏ YANAŞI**

Tarix Seyyidüş-şühədanın Mədinədən Məkkəyə hərəkatı barəsində bizə müxtəlif məlumatlar çatdırmışdır. Tarix müxtəlif insanların ürəkyananlığı, o həzrəti Mədinədə çıxmaq fikrindən daşındırmaq cəhdələri, əmin-amanlı yerlərə sığınmaq təklifləri və nəhayət qohumların, xüsusilə imamla ailə və qohumluq əlaqəsi olan ağlama, nalə və .şivələrini gözəl surətdə bəyan etmişdir

Zeynəb imamət məqamını tanıdığından yaxşı bilir ki, məsum imam öz şəxsi iradə və istəyinə uyğun deyil, ilahi vəzifəsinə əsasən iş görüb, hər hansı bir fikrə gəlir. Buna görə də tarixdə onun haqqında imam Hüseyn (ə)-ı ilahi işindən saxlamaq üçün heç bir .təklif görülmür. O, bu işdə öz imamına müti və təsəllidir

Zeynəb Mədinədən Kərbəlaya qədər imam Hüseyn (ə)-ın yanında olmuşdur. O, bu səfəri öz izdivacından qabaq duymuş və öz nikahında imam Hüseyn (ə)-la birgə olmağı .şərt etmişdi. İndi isə, bu şərtdən istifadə etməyin vaxtı çatmışdı

Yaşı ۵۰-ni ötmüş, oğul-uşaq, ailə sahibi olmuş bir qadın üçün belə bir qəm karvanını müşayiət etmək, ruhi və cismi çətinliklər, ağır təhlükələrlə rastlaşmaq nə qədər çətin olsa da, zamanın imamına və Hüseyn kimi əziz qardaşına olan sonsuz eşq və dərin .məhəbbət bütün bunları həzrəti Zeynəb (s)-a olduqca asan etmişdi

O, bilirdi ki, Hüseyn (ə) Allahın höccəti, Peyğəmbər canişini, onun və zamanın bütün .insanlarının imamıdır

Onunla yoldaşlıq etmək həqiqətdə insani fəzilətlə yoldaşlıq etmək, əbədi səadətə çatmaq deməkdir. Zeynəb, elə bunun üçün də özünü hər növ müsibətə hazır edib, müqəddəs məqsəd üçün ev, ailə və ümumiyyətlə həyatdan imtina etməyə hazırlaşıb, Allah eşqi ilə dolu bir qəlb və polad iradə ilə insaniyyətin əzəmətini özü ilə aparan bir .yola qədəm qoyur

## KARVANDA MƏSULİYYƏT

Zeynəb karvan böyüklərindəndir və onun idarə olunmasında mühüm məsuliyyəti var. .O, bütün hərəkət və qəmli səhnələrdə özünəməxsus vüqar və əzəməti ilə iştirak edir

Zeynəb bütün çətinlik və müsibətlərdə özünü qardaşı Hüseynə şərik bilir. O, Zəhra yadigarıdır və elə bil, anasının əvəzinə Hüseyn və övladlarına gözlənilən müsibət və .bəlalara hazır olur

Doğrudan da onu Seyyidüş-şühəda hərəkatının ən böyük himayəçisi hesab etmək olar. O, bu işini imamla birgə və çiyin-çiyinə başlayıb iradə və təmkinliklə yerinə .yetirirdi

Tarixdə bəzi hərəkat, yol və səhnələrdə adının qeyd olunmasına baxmayaraq, cürətlə demək olar ki, Zeynəb onların hamısında fəal surətdə iştirak etmişdir. Karvanı idarə etməkdə onun imamla yaxın əlaqəsi, onunla fikri, ruhi və mənəvi əlaqəsi və öhdəsinə .qoyulmuş böyük məsuliyyət bu həqiqətə əyani sübutdur

O, Əhli-beyt və imam dostlarının qadın və uşaqlarının böyüyü idi. Tasua günü və ondan qabaqkı günlər baş verən hadisələr, imam Hüseyn (ə)-ın Zeynəblə söhbəti, onun bacısına Əhli-beyti himayə barəsində olan tövsiyələri açıq-aşkar onun karvanda olan .məsuliyyətini göstərir

Zeynəb imam Hüseyn (ə) sirlərinin məhrəmi və əmanətdarı idi, gərək qardaşının onun .boynuna qoyduğu əmanət yükünü məqsədə çatdıraydı

## MƏKKƏYƏ GİRİŞİ

Karvan Məkkəyə yetişdi və imam Hüseyn (ə)-ın neçə günlük səfəri Mədinədən Məkkəyə çatmaqla sona çatdı. Seyyidüş-şühəda şəhərə daxil olanda Qurandan bir :ayə oxudu: Bu ayə həzrət Musanın Mədinəyə daxil olarkən dediyi sözlər idi

.«Vələmma təvəccəhə tilqaə mədyənə qalə əsa rəbbi ənyəhdiyəni səvaəs-səbil»

Məkkə imam Hüseyn (ə) üçün münasib mövqeyə malik idi. İmam (ə) orada qaldığı müddətdə Məkkə xalqının müxtəlif təbəqələri, həmçinin ətrafdan gəlmiş hacılarla .görüşə bildi

İmam Hüseyn (ə)-ın Məkkədə qalmasından qırx gündən artıq vaxt keçirdi. Bu müddət ərzində Kufə şiələrindən saysız məktublar çatırdı. Onlar öz məktublarında əməvi hökməti ilə mübarizə aparacaqlarını elan edir və imam Hüseyn (ə)-ın hökumət və .rəhbərliyini qəbul etdiklərini bildirirdilər

## MÜSLÜM İBNİ ƏQİLƏ TAPŞIRIQ

İmam Hüseyn (ə) Kufə şiələri tərəfindən gələn və imamı himayə etmələrini bildirən məktublar selinə cavab olaraq bir məktub yazıb buyurdu: “Mən qardaşım, əmim oğlu və bizim xanədanın etimad etdiyi Müslüm ibni Əqili göndərirəm. Əgər iddialarınızın doğruluğu barəsində xəbər göndərsə və sizin yazdığınız kimi olduğunuzu bildirsə .yanınıza gələcəyəm

İmamın rəsmi nümayəndəsi, Müslüm ibni Əqil mübarək Ramazan ayının ortası Məkkədən çıxıb Şəvvalın ۵-də Kufəyə daxil oldu. Kufədə imam Hüseyn (ə)-ın nümayəndəsi misilsiz tərzdə qarşılandı və ۱۸۰۰۰ nəfər Müslümün vasitəsi ilə İmama beyət etdilər. Müslüm onların himayəsinə əmin olandan sonra İmama bir məktub .yazıb, Həzrəti Kufəyə dəvət etdi

səh:۱۶

## HƏRƏKAT QƏSDİ

Müslüm ibni Əqilin məktubu Məkkədə imam Hüseyn (ə)-a yetişdi. O həzrətin Məkkədə qalmasından ۴ aydan artıq vaxt keçirdi. Həcc mərasimi günləri çatmışdı. Məktubun həcc mərasiminə təsadüf etməsi İmamın həcc əməllərindən sonra Kufəyə getməsinə səbəb oldu. Bu səbəbdən imam ehram libası geyinir və möhrim olur. Sonra bilirlər ki, Yezidin muzdur məmurlarından bir qurupu həcc əməlini yerinə yetirmək adı altında Məkkəyə gəlirlər ki, İmamı tutub Yezidin yanına aparsınlar və ya öldürsünlər. Buna görə də Həzrət Allah evinin hörmətini qorumaq üçün həcci ümrəyə çevirib ehramdan .xaric olur və elə həmin gün qərara gəlir ki, Məkkədən Kufəyə hərəkət etsin

## MÜSLÜMÜN QİYAMI VƏ İMAMIN HƏRƏKATI

İbni Ziyadın Kufədə yaratdığı qorxu və vəhşət və kufəlilərin vəfasızlığı səbəb oldu ki, Müslüm ibni Əqil ilə beyət edib İmamı himayə etmək istəyən Kufə əhli ani olaraq öz .sözlərini geri götürüb, İmamın nümayəndəsini tək qoysunlar

Beləliklə, neçə gün bundan əvvəl ۱۸۰۰۰ mindən çox adamı olan Müslüm tək-tənha qalıb .İbni Ziyad əskərləri tərəfindən qətlə yetirildi

Kufə əhlinin vəfasızılığı və Müslümün qətli zamını, yəni ۶۰-cı il Zilhiccə ayının səkkizi imam Hüseyn (ə)-da Məkkədən çıxdı. O vaxtacan Kufə əhlinin vəfasızlığı barəsində İmama heç bir məlumat çatmamışdı. Odur ki, Həzrət kufəlilərin rəsmi dəvətinə və .Müslümün məktubuna əsasən İraqa tərəf yola düşdü

## ÜMUMİ DƏVƏT

İmam (ə) Məkkədən çıxan zaman bir xütbə oxuyub orada bəzi gələcək hadisələri təkrarlayaraq özünün şəhadətə olan eşqini izhar etdi. Sonda isə, bir cümlə ilə Əhli-beyt yolunda şəhadət aşiqləri və Allah görüşünə nail olmaq istəyənlərə öz ümumi :dəvətini bildirdi

Həmd Allah üçündür. Allah istədiyi olacaqdır və onun iradəsindən başqa heç bir qüvvə“ .”hökm edə bilməz. Allahın salamı olsun Onun Rəsuluna

Boyunbağı qızlara yaraşdığı kimi, ölüm də insanlar üçün lazımdır. Yəqubun Yusifi

görməyə eşqi nə qədər idisə, mənim də ata-babalarımı görməyə eşqim o qədərdir. Mənim üçün bir qətligah təyin olunub və elə bil, öz gözlərimlə görürəm ki, çölün vəhşiləri (Kufə ordusu) nəvavis və Kərbəla arasında mənim bədən üzvlərimi tikə-tikə doğrayıb öz ac qarınlarını doyururlar. Qəza və qədər qələmi ilə yazılan bir işdən çarə və çıxış yolu yoxdur. Allahın razı olduğu hər bir şeyə biz də razıyıq. Bəla və imtahan qarşısında səbr edib dözərik. Allah səbr edənlərə vəd etdiyi əcri bizə əta edəcəkdir. Peyğəmbərlə onun övladları arasında heç vaxt ayrılıq düşməyəcək. Səfalı behiştdə onun yanında olacaqlar. çünki, (dünyada) onun şadlığına səbəb olublar və onun vədəsi .də (Allah hökmətinin bərpası) onların vasitəsi ilə həyata keçəcəkdir

Bilin ki, mən sabah sübh hərəkət edəcəyəm – İnşəallah. Sizlərdən bizim yolumuzda öz qanından keçməyə və canını Allah görüşü və şəhadət yolunda qurban verməyə hazır .olan hər bir kimsə bizimlə səfərə hazırlaşsın

### ƏBDULLAH İBNİ CƏFƏRİN MƏKTUBU

İmam Hüseyn (ə)-ın Məkkədən Kufəyə getməsi xəbəri sürətlə hər yerə yayıldı. çünki, Hüseyn müsəlmanlar üçün adi bir adam və hərəkət günü də – Zilhiccənin səkkizi - adi .bir gün deyildi ki, İmam Məkkədən çıxsın

İmam bu hərəkəti ilə hamını düşündürürdü ki, niyə peyğəmbər övladı həcc əməlini sona çatdırmadan Məkkəni tərk etsin. Bu iş Məkkədə olan və İmamın hərəkətini eşidən bütün müsəlmanların marağını artırdı. Bununla da Əməvi hökumət başçılarının rüsvayçılığı və müsəlmanların imamı gözləyən təhlükələr sarıdan nigarançılığına bais .oldu

İmamın Məkkədən hicrət səbəbini eşitməklə bəziləri xeyirxahlıq və nəsihət məqsədi ilə İmamı Kufəyə sarı başladığı hərəkətdən saxlamaq istədilər. Seyyidüş-şühədanın getmək xəbərini eşitməklə, onu bu fikirdən daşındırmaq üçün məktub yazanlardan biri də Əbdullah ibni Cəfər, İmamın əmisi oğlu həzrət Zeynəbin əri idi. O, öz məktubunda məhəbbət və canıyananlıqla İmamın gələcəyindən narahat olduğunu bildirməklə yanaşı, xahiş etdi ki, həzrət bu fikirdən daşınsın. O, öz məktubunu Oun və Məhəmməd adlı iki oğlu vasitəsilə imama təqdim etdi və sonda əlavə etdi ki, məktubdan sonra .özüm də sənə yetişəcəyəm

### ACI XƏBƏR

Hüseyn (ə) karvanı Məkkədən İraqa tərəf hərəkətdədir. Aram-aram Məkkədən uzaqlaşıb İraqa yaxınlaşır. Yol boyu müxtəlif hadisələr baş verir. İmam bəzi .dayanacaqlarda müsəlmanları onlara qoşulmağa çağırır

Züheyr ibni Qin kimi bəziləri vəfalı və mömin həyat yoldaşının təşviqi ilə imamın dəvətinə ləbbeyk deyir. Bəziləri isə əsassız dəlillərlə əbədi səadətdən məhrum .qalırdılar

Karvan əhli gecə vaxtı Sələbiyyə adlı bir yerə çatdılar. Yoldan təzə yetişmiş və mühüm .xəbərləri olan iki Əhli-beyt dostu İmamın görüşünə tələsirlər

?Onlar: Bu xəbəri aşkar, hamının yanında deyək, ya məxfi və xüsusi

Həzrət o iki nəfərə və öz dostlarına baxıb buyurdu: Mən dostlarımdan bir şey .gizlətmirəm. Bizim aramızda sirr yoxdur

Bizə doğru və mötəbər bir xəbər çatıb ki, Müslüm və Hanini Kufədə qətlə yetirib, .bədənlərini bazarda yerlə sürüyüblər

:Həzərt bu xəbəri eşidən kimi neçə dəfə buyurdu

.«İnna lilla və inna iləyhi raciun»

Allah onlara rəhmət etsin" Sonra ağlayıb özləri və işləri üçün dua etdi. Daha sonra isə" buyurdu: "Hər kəs istəsə bizdən ayrılsın. Azaddır və heç bir məsuliyyəti də yoxdur". Bu sözdən sonra bir dəstə həzrətin dövrəsindən dağıldı və İmam Məkkədən onunla gələn bir dəstənin arasında qaldı. Bu imam Hüseyn (ə)-ın Kərbəlaya hərəkəti yolunda onun dostlarından alınan ilk imtahan idi ki, iman və sədaqətlə həzrətlə yoldaşlıq edənlər .dünya tamahı, məqam və rəyasət istəyi ilə ona qoşulanlardan ayrıldılar

**?ZEYNƏB NƏ EŞİTDİ**

İmam Hüseyn (ə)-ın İraqa tərəf hərəkəti yolunda tarixin Zeynəblə bağlı nəql etdiyi ilk .macəra "Xüzeyriyyə" adlı bir mənzilə aiddir. İmam bir gecə və gündüz burada qaldı

Bir səhər Zeynəb imamın xidmətinə yetişib dedi: «Qardaşım, dünən eşitdiyim bir sözü sənə söyləyimmi?» İmam buyurdu: «nə söz?» Zeynəb dedi: Dünən gecə xeymədən çıxdım. Eşitdim ki, qeybdən səda gəlir və deyir: "Ey göz, səy et, çox ağla! Kimdir ki, "?gələcəkdə şəhidlərə, ölümün izlədiyi kəslərə, əhdinə vəfa edənlərə ağlasın

İmam bu sözləri eşidib buyurdu: "Bacı, Allahın hökm verdiyi və öz qəzasında yazdığı ".olacaqdır

.Bu hadisə həzrət Zeynəbin öz qardaşı ilə sirdaş və həmdəm olduğunu göstərir

**KƏRBƏLA VƏ ƏBƏDİYYƏT**

Kərbəla" şiə lüğətnaməsində çox işlənən sözlərdəndir. Bir müsəlman tapmaq olmaz" ki, Kərbəla adını eşitməmiş olsun. çünki, Kərbəla islam və Quranla, izzət və cihadla və .bütün yaxşılıqlarla sıx bağlıdır

Axı Kərbəlaya biganə olan kəs, könlünü nəyə verəcəkdir? Müsəlmanlıq, Peyğəmbər və ?Əhli-beyt ilə dostluq iddiası edən bir insan Kərbəla səhnələri ilə tanış olmaya bilərmi

Əgər bu gün dünyada xalis tohid parlayır və Kəbə, Allah və islam eşqi ilə dolu qəlblərin təvaf yeridirsə, heç şübhəsiz ki, bunlar Peyğəmbərin üzücü zəhmətləri hesabına başa gəlmişdir. Amma bu da şübhəsizdir ki, əgər Hüseyn (ə)-ın qiyamı olmasaydı, bu gün o zəhmətlərdən heç bir əsər-əlamət qalmazdı. Məgər bu qiyam Peyğəmbər dinini

diriltmək və islami dəyərləri qorumaq üçün deyildimi ki, Allah Rəsulunun yerində ?Müaviyə və Yezid kimi murdar iddiaçılar oturmuşdular

Kərbəla vaqiyəsi imamın həyatının yalnız son günlərini təşkil etməsinə baxmayaraq, bu günlərin əzəmət və cəlalı bəşər tarixinin o dahi simasının bütün həyatını üstələmiş və Hüseyn adını həmişə Kərbəla adı ilə yoldaş etmişdir. Elə bil, imamın bütün həyatı bu dövrdə xülasə olmuşdur. Bu orada, Zeynəbin adı da qardaşı Hüseynin adı kimi Kərbəla .ilə yanaşı çəkilir

Zeynəbin Kərbəlaya daxil olması ilə onun həyat tarixi də əbədiyyətə qovuşdu. Harada Hüseyn var, Kərbəla var, orada Zeynəb də var. Kərbəla tarixi həm də Zeynəb tarixi .deməkdir

Bu əzəmət və cəlal Zeynəbin Kərbəladakı və Aşuradkı sonrakı həyat tarixinin onun .həyatının başqa dövrlərindən daha aydın səbt olunmasına səbəb olub

## KƏRBƏLAYA GİRİŞ

İmamın karvanı Mədinədən çıxandan ٥ ay sonra – ٦١-ci ilin Məhərrəm ayının ikisində .Kərbəlaya daxil oldu

İmam bu yerə girən kimi onun adını soruşdu. Cavab verib buranın Kərbəla olduğunu söylədilər. İmam Kərbəla sözünü eşidib ağladı və dua etdi: "İlahi, Sənə kərb (qəm) və bəladan pənah aparıram." Sonra buyurdu: "Enin. Bura xeymə mənzillərimizin yeridir. "Bu xəbərləri babam Peyğəmbər mənə buyurub

Rahat olun mənziliniz Kərbəla

.Hər qarışı könlünüzə aşına

Zeynəb Kərbəlaya daxil olur. O, bilir ki, bura onun qardaşı ilə olacağı son mənzildir. Elə .o səbəbdən də, imamın şəhadətinə qədər ondan bir an da ayrılmır

## ZƏRURƏTİN SÜBUTU

İmam Mədinədən çıxarkən Bəni-haşimə yazdığı müxtəsər məktubdan əlavə müxtəlif yerlərdə özünü və yoldaşlarının şəhadətindən rəsmi surətdə bir başa xəbər vermişdi: Kim mənimlə olsa şəhadətə yetişəcək və mənə qoşulmasa müvəffəq olmayacaqdır. .Bu yerlərdən biri də Kərbəlaya daxil olan zaman idi

Həzrət onunla çoxlu mərhələlər keçən, həyat eşqi və isar vadisinə çatan yoldaşlarına zərurəti sübut etmək üçün öz yol və məqsədini bəyan edir. Tarix göstərir ki, imamla .birgə Kərbəlaya qədəm qoyan şəxslərdən heç biri imamı tərk etməmişdir

Bəli, Allah eşqi və Əhli-beyt vilayəti ilə gələnlər axıra qədər qaldılar ki, özlərinin ən

yaxşı varlarını əbədi və gözəl məqsədə qurban edib adlarını tarixin qızıl hərflərlə qeyd etdiyi Hüseyn və Kərbəla adları ilə yanaşı yazdırsınlar. özünü qardaşına və onun yoluna qurban demiş Zeynəbin çiynində bu vəzifədən ağır bir yük vardır və onun .nəticəyə çatmağına qədər o yolda olacaqdır

## !YEZİDLƏ BEYƏT? HEÇ ZAMAN

Məhərrəm ayının ۲-i Aşura karvanının Kərbəlaya daxil olduğu gün Əməvi hökuməti imam Hüseyn (ə)-la qarşılaşmaq üçün oraya yaxşı təchiz olunmuş və çoxlu sayda .hərbi qüvvə ezam etdi

İmamdan istədikləri bircə kəlmə idi. Yezidlə beyət! Elə imamın indiyəcən nəinki qəbul .etmədiyi və heç zehnindən belə keçirmədiyi də həmin məsələ idi

Hər iki tərəfin tələb və istəkləri barəsində çoxlu müzakirələr aparılmasına baxmayaraq İmamın qəti mövqeyi əvvəldən bəlli idi. Onun cavabı həmən cavab idi ki, ilk dəfə hökumətin Mədinədən nümayəndəsinə buyurdu və mövqeyi də həmən mövqe idi ki, imamət məqamında nabələdlərin qarşısında tutmuşdu: “Yezidin istədiklərinə ”.təslim olmayıb onunla beyət etmək

Zeynəbi-Kubra (s) bütün bu səhnələrdə qardaşının yanında olub onun ilahi qərarları qarşısında itaət və təslimçilikdən başqa bir şey düşünmürdü. Tarix sübut edir ki, onun imamın istəyindən ayrı bir istəyi olmamışdır. Elə ona görə də heç vaxt və heç yerdə narazılıq, peşmanlıq bildirmədi. Allah eşqi ilə, İmamla birgə Mədinədən Məkkəyə və Məkkədən Kərbəlaya gələn bir bacıdan elə gözləmək olar ki, hər yerdə İmamının .istəyinə təslim olub, başqa bir istəkdən vaz keçsin

## DÜŞMƏN QARŞISINDA MÜQAVİMƏT

İmam Hüseyn (ə)-ın və dostlarının bu meydanda şücaət və müqavimətləri düşmənin öz gücünü artırmasına və nəhayət ayın ۷-də su yollarını bağlamasına səbəb oldu. Bir neçə dəfə İmam, dostları su gətirsələr də şücaət və şəhadət günü olan Aşuraya qədər bu vəziyyət davam etdi. Suyun olmaması üç gün Kərbəlanın isti və quru çölündə .Hüseyn (ə)-ın xeymələri qarşısında əsas problemlərdən biri olmuşdur

Bu fəsildə bütün çətinliklərə baxmayaraq İmamın əhli-əyalının, uşaqların və xeymələrin idarəsini öhdəsinə götürmüş həzrət Zeynəb (s) bu məsələnin həllində tədbir və isar ilə uşaqları sakitləşdirmək üçün çalışmalı və düşmənin bu alçaqlığı .qarşısında zəiflik və zillət büruzə verməməli idi

## TASUA GÜNÜ

Tasua doqquzuncu gün deməkdir. Şiə lüğətində Məhərrəm ayının doqquzuna Tasua deyilir. Tasua, imam Sadiq (ə)-ın sözünə əsasən imam Hüseyn (ə) və səhabələrinin .Kərbəlada mühasirəyə düşdüyü gündür

Əhli-beyt düşərgəsinin mühasirəyə düşməsi ilə vəziyyət daha da ağırlaşdı, hər növ .kömək və qüvvə çatdırılması qeyri-mümkün oldu

Kufə şəhərindən, Ubeydullah ibni Ziyaddan ömər Sədə rəsmi bir məktub çatdı. Məktub tezliklə qiyamçılara təzyiq göstərmək əmrindən ibarət idi. Bu məktubun ardınca Tasua günü, günortadan sonra ömər Səd rəsmən hücum fərmanı verdi. Bu

zaman İmam xeyməsinin qabağında qılınc əlində, başını qollarına qoyub yuxuya .getmişdi

Düşmənin hərəkətini görüb, səslərini eşidən Zeynəb qardaşının yanına gəlir: “Qardaş, düşmən ordusunun səsini eşitmirsən? Onlar artıq yaxınlaşıblar.” İmam Hüseyn (ə) başını qaldırıb deyir: “İndicə Peyğəmbəri yuxuda gördüm. O, mənə deyirdi ki, sən bizim ”.yanımıza gələcəksən

Zeynəb bunu eşitcək ağlamağa başladı, İmam isə buyurdu: “Sakit ol bacı, Allah sənə ”.rəhm etsin

Bu zaman İmam üzünü bayraqdarı və qəhrəman əsgəri Əbbasa tərəf tutub buyurdu: ”.“Canım sənə qurban, düşmənlə görüş, gör nə istəyirlər

Əbbas, Züheyr və Həbib ibni Məzahir olmaqla iyirmi nəfərdən ibarət dəstəylə düşmənin yanına gəldi. Onların vuruşmaq niyyətində olduqlarını bildikdən sonra isə, .qardaşının yanına qayıdıb əhvalatı danışdı

İmam buyurdu: Onlara deyin bu gecəni möhlət versinlər ki, namaz, dua və tövbə ilə .məşğul olaq. Allah şahiddir ki, mən namaz və Quranı, dua və tövbəni çox sevirəm

Beləliklə Aşura gecəsini düşməndən möhlət alıb, dua, namaz və zikr ilə özlərini məbud .və məşuqlarının görüşlərinə hazırlayırdılar

Bəli, Aşura gecəsi İmam və dostları üçün son fürsət idi. Tarix bu gecə haqqında gözəl .və parlaq səhnələr nəql etmişdi

### AŞURA GECƏSİNDƏ ZEYNƏB ŞƏFQƏTİ

Aşura gecəsi son gecədir ki, İmamın mübarək vücudu Əhli-beyt xeymələrinə nur saçır. O gecə hamı öz ilahi vəzifəsi ilə məşğul idi. Bir hərəkat rəhbəri kimi, imam Hüseyn (ə)-ın məsuliyyəti hamıdan ağırdır. Ondan sonra isə, həzrət Zeynəb (s) İmamın vəfalı .bacısı bu ağır və məsuliyyətli vəzifəni öhdəsinə götürmüşdü

Təsəvvür etmirik ki, bu əzəmətdə ruh və bu əhəmiyyətdə vəzifəsi olan Zeynəbin, belə .bir həssas zamanda Zeynəbin gözünə yuxu getmiş ola

İmam Səccad (ə)-ın canını qorumaq, ona tibbi yardım göstərmək Aşura gecəsi və ondan sonra Zeynəbin ən böyük vəzifəsi idi. Bu köməklərdən bəziləri imam Səccaddan .nəql olunmuşdur

Zeynəb düşmənin cinayət və zülmləri qarşısında imamət keşikçisidir. İmamət xətti həzrəti imam Səccad (ə) vasitəsi ilə davam etməli idi. Və bəlkə elə ona görə də Allahın məsləhəti ilə xəstələnmişdi. Düşmən istər Aşura günü, istərsə də ondan sonrakı mərhələlərdə dəfələrlə imam Səccad (ə)-ın canına qəsd etməyə cəhd göstərmişdi, .lakin hər dəfə də Zeynəbin amansız təzyiq və etirazlarına məruz qalmışdı

## ZEYNƏB BƏNİ–HAŞİM MÜDRİKİ

Əli və Fatimə məktəbində, Həsən və Hüseyn yanında böyümüş Zeynəb, həyatın mənasını, insani təkamülü yaxşıca dərk edir və könül verdiyi bu yolda hərəkət edirdi. Elə ona görə də, keçdiyi məqsəd yolunda əsla tərəddüd etmədən, özünə məxsus .əzəmət və vüqarı ilə diqqəti cəlb edir

O böyük və təsirli hadisələrdə hissiyata qapılıb, duyğularının təsiri altına düşmür və öz mühüm vəzifəsini unutmurdu. O, ən isti məhəbbət duyğularına malik olmaqla yanaşı, həm də müdrik bir insandır. Yəni qadın və qadına məxsus insani hisslərə malik olmasına baxmayaraq, bütün acı və dərdli səhnələrdə aqilanə mövqe tutur və vəzifəsinin icrasını unutmur. Bu xüsusiyyət, Zeynəbə öz yolunu sonacan davam etdirməkdə, Kərbəla şəhidlərinin qanlarını səmərəyə yetirmək və Aşura hərəkatının əsil ideya və məqsədlərini hamıya çatdırmaqda kömək edirdi. Bu məqamı Kərbəlada .və ondan sonrakı dövrdə baş verən bütün hadisələrdə müşahidə etmək olur

## ZEYNƏBİ ÜZƏN XƏBƏR

İmam Səccad (ə) buyurur: Atam şəhid olan günün gecəsi mən xəstə idim. Bibim Zeynəb mənimlə məşğul idi. Atam öz xeyməsinə getdi. Əbuzərin azad etdiyi qul Con :onun yanında qılıncını təmir edirdi. Atam neçə dəfə bu şeri oxuyurdu

Ya dəhru uffin ləkə min xəlil

Kəm ləkə bil işraqi vəl əsil

Min sahibin və talibin qətil

Vəd-dəhru la yəqnəu bil bədil

Və innəməl əmru iləl cəlil

Və kullu həyyin salikun səbil

Ey ruzigar bezmişəm səndən. Sən nə pis dostsan! nə vaxtacan səhər və axşam“ qanına qəltan olmuş (insan) arzu edəcəksən? Ruzigar heç kimi başqasının yerinə qəbul

”.etmir. ölüm Allahın əlindədir və hamı ölüm yolu keçəcəkdir

Atamın bu şerləri oxumaqdan məqsədini anladım. Məni ağlamaq tutdu, amma sükut etdim və bildim ki, bəla və müsibət gəlmişdir. Lakin, bunları eşidən bibim özünü saxlaya bilmədi. Pərişan halda atamın yanına gəlib dedi: “Kaş ölüm gəlib, mənim həyatıma son qoyaydı. Bu gün anam Fatimə, atam Əli və qardaşım Həsən dünyadan !getdikləri gün kimidir. Ey qardaş! Ey gedənlərin canişini və qalanların pənahı

İmam Hüseyn (ə) Zeynəbə baxıb buyurdu: “Əziz bacım! Səy et ki, Şeytan səbrini ”.əlindən almasın

səh:۲۳

Sonra isə gözləri dolmuş halda bu məsəli dedi: “Əgər ovçu Qəta quşunu rahat (.qoysaydı, yuvasında yatardı.” (Yəni düşmən bizdən əl çəkməyəcək

Sonra bibim dilləndi: “Bizi daha çox ağrıdan odur ki, sənin üçün çıxış yolu olmaya və .çarəsiz ölüm şərbətini içəsən.” Bunu deyəndən sonra o, huşunu itirib yerə yıxıldı

## SEYYÜDÜŞ–ŞÜHƏDA MÜSİBƏTİNİN ƏZƏMƏTİ

Həzrət Zeynəbin taqətsizliyi və huşdan getməsi, onun imam Hüseyn (ə)-a olan sonsuz məhəbbəti və habelə seyyüdüş-şühəda müsibətinin əzəmət və böyüklüyündən xəbər verir. Bu əzəmət və böyüklük Allah kəlamı olan “Aşura ziyarətində də aydın nəzərə ”.çarpır

Ya Əba Əbdillah, ləqəd əzumətir-rəziyyətu. Vəcəllət və əzumətil musəbtu bikə ələyna » və əla cəmii əhlil islami vəcəllət və əzumət musibətukə fissəmavati əla cəmii əhlis-.«səmavat

Ey Əba Əbdillah! Həqiqətən sənin müsibətin böyük müsibətdir. Sənin müsibətin bizə“ ”.və bütün islam əhlinə böyük və əzəmətlidir

.Sənin müsibətin göylərdə bütün səmavi mövcudlara da böyük və əzəmətlidir

Həzrət imam Hüseyn (ə)-ın müsibətinin əzəmət və böyüklüyünü imam Zaman (ə)-ın müqəddəs nahiyə ziyarətindəki yanıqlı sözlərindən də başa düşmək olar. O, seyyidüş-şühədaya xitabən deyir: “Baxmayaraq ki, dövran bizi ayrı saldı və Allahın təqdiri məni sənə kömək etməyə qoymadı. Mən o vaxt olmadım ki, səninlə döyüşənlərlə döyüşüb, sənin döüşmənlərinlə düşmənçilik edəm. Amma, sənin müsibətlərin üçün təəssüf və həsrətlə gecə-gündüz ağlaram. (Və əgər gözlərimin yaşı qurusa) sənin üçün yaş ”!yerinə qan ağlaram, qəm və qüssənin şiddətində can verənədək

İmam Hüseyn (ə)-ın şəhadətinin ağırlığı imam Rza (ə)-ın kəlamında da əks .olunmuşdur

.«Ləqəd bəkətis-səmavatis-səbi vəl ərəzunə liqətlihi»

”.Seyyidüş-şühəda (ə)-ın şəhadətində yeddi asiman və yerlər ağladılar“

:Həmçinin buyurur

.«Ləmma qutilə cəddiyəl Husəyn əmtərət-tisəmau dəmən və turəbən əhmərə»

Cəddim Hüseyn ölən zaman səmadan qan və qırmızı torpaq yağdı.” Əcəba! Bu nə“ müsibətdir ki, yer və göyləri, cin və mələkləri, aləmin bütün mövcudatını matəmə qərq !etdi

Zeynəbin böyük qəlbi isə əzəmət və təntənə ilə bu müsibətlərə tamaşa edir və öz .təmkini ilə hamını heyrətə salır

Bəli, Zeynəb ruhu kimi əzəmət və cəlallı bir ruh, Zeynəb qədəmləri kimi möhkəm qədəm, Zeynəb qəlbi kimi böyük qəlb və Zeynəb ürəyi kimi geniş ürək lazımdır ki, .bütün bu müsəbətli yolları qət edib axıracan hərəkət etsin

səh:۲۴

## İMAMIN ZEYNƏBƏ TÖVSİYƏLƏRİ

Gördük ki, imam Hüseyn (ə)-ın acı şəhadət xəbəri Zeynəbə necə təsir etdi. Bu xəbər o .qədər ağır idi ki, onun taqətini alıb bihuş edərək yerə yıxdı

İmam Səccad (ə) buyurur: "Atam Hüseyn bibimin üzünə su səpib ayıltdı və buyurdu:" Ey bacım! Təqvanı uca tut, səbirli ol! Bil ki, bütün yer və göy sakinləri öləcəklər və Allah-təalanın müqəddəs zatından başqa hər şey fani olacaqdır. Babam, atam, anam və qardaşım məndən üstün idilər, lakin onlar da getdilər. Hər bir müsəlman Peyğəmbərə iqtida edib, onu özü üçün nümunə bilməlidir. Bacı səni and verirəm və istəyirəm ki, bu andıma əməl edəsən: Olmasın ki, mənim müsibətimdə üz və yaxanı cırasan və ya ".mənim şəhadətimdə ucadan nalə və fəqan edəsən

İmam Səccad (ə) buyurur: Atam bu tövsiyələrdən sonra bibimi mənim yanımda :oturtdu

Zeynəbin vəhy və vilayət evində tərbiyə olmasına baxmayaraq, qardaşı və imamının dilindən eşitdiyi tövsiyələr onda dərin təsir qoydu. Zeynəbin ruhunu daha müqavimətli, qamətini daha mətin, müsibətlər qarşısında iradəsini daha möhkəm etdi və həqiqətdə .ona böyük iman bəxş etdi

## ZEYNƏBDƏN ÖYRƏNİLƏSİ DƏRS

Tarix göstərir ki, Zeynəb zəmanə imamının göstəriş və tövsiyələrinə sözsüz əməl edirdi. Bu qısa cümələlər onun lətif və möhkəm ruhunda elə ciddi təsir buraxdı ki, nəinki təkcə heç bir müsibət qarşısında sarsılıb şikayət etmədi, hətta dağ kimi, dağdan da möhkəm müqavimətlə mübarizəni davam etdirdi. Baxmayaraq ki, onun dağlı sinəsinə oturan hər təzə dərd, müsibətlərinə əlavə olan hər yeni müsibət güc və taqətini əlindən alırdı, lakin Zeynəb var qüvvəsi ilə çalışırdı ki, bu müsibətlər onu əldən salmasın, bu saysız-hesabsız dərd-bəlalar onu mühüm vəzifəsinin icrasından .saxlamasın

O, qiyamın hədəf və məqsədlərini çatdırmaq barədə öz imamının tövsiyələrinə əməl etməklə sübut etdi ki, həqiqi mömin kimi dağdan möhkəmdir, zillət və müsibətlərə boyun əyməz. Bəli, Zeynəbin tükənməz müsibət dalğaları qarşısında səbr və

yenilməzliyi, əbədi olaraq onun adını ilahi vəzifənin icrası yolunda səbr və yenilməzlik .simvoluna çevirdi

Şəhid və yaralıların anaları, onların həyat yoldaşları Zeynəbi-Kubranın hərəkət yollarını diqqətlə izləməklə öz mühüm vəzifələrindən agah olmalıdırlar. Onlar müsibət və çətinliklər qarşısında ən gözəl və nümunəvi səbr nümayiş etdirərək Zeynəbdən dərs alıb özlərini onun məktəbinin davamçısı bilsinlər və Allah yolunda olan bütün .çətinlikləri Zeynəb kimi asan və gözəl hesab etsinlər

## GECƏNİN QARANLIĞINDA

Aşura və Aşura gecəsinin əzəməti demək, eşitmək, oxumaq-yazmaqla dərk olunası .deyil. Onun zirvəsinə fikir çatmaz. Ürək bu əzəməti dərk etməyə acizdir

O gecə və o günün əzəmətini Aşuraçılar dərk edərlər. Onlar ki, Hüseyn və Allahına iman gətirmiş və onun üçün can vermək intizarında onları sayırdılar. Onlar ki, Büreyr və Əbdürrəhman kimi Aşura gecəsinin son saatlarında çox şad idilər. Onlar ki, Aşura gecəsi sübhəcən dua, münacat və istiğfarla məşğul idilər. Onların razi-niyaz səsləri arı pətəklərinin səsləri kimi fəzanı doldurmuşdu. Hərəkatın rəhbərliyi və ən ağır məşğuliyyətlər çiyininə düşmüş imam Hüseyn (ə) o gecənin qaranlığında xeymələrdən uzaqlaşır. İmamın dostlarından nafe ibni Hilal adlı birisi özünü imama çatdırıb onun bu qeyri adi hərəkətindən narahat olduğunu bildirir. İmam cavabında buyurur: "Gəlmişəm xeymələrin ətrafının alçaq-hündürlüyünə baxam. Olmaya, orada bir pusqu ola, ".düşmən oradan hücum edə və ya müdafiə oluna

Sonra imam nafenin əlini ovcunda tutduğu halda buyurdu: Bu gecə həmin vəd !olunmuş gecədir, labüd bir vəd

Sonra imam uzaqdan görünən iki daşı ona göstərib buyurdu: Bu gecənin qaranlığında ?özünü xilas etmək üçün bu iki daşın arsından qaçmaq istəmirsən

nafe bu sözləri eşidən kimi özünü imamın ayaqlarına salıb dedi: Anam matəmimdə otursun! Mən qılınc və atımı, hərəsini min dirhəmə almışam. Məni sənin vücudunun .neməti ilə bəhrələndirən Allaha and olsun, onlar durduqca səndən ayrılan deyiləm

## ZEYNƏBİN İMAMLA SÖHBƏTİ

Həzrət ətrafı yoxladıqdan sonra xeymələrə tərəf qayıdıb bacısının xeyməsinə girir. nafe deyir: "Mən xeymənin çölündə durmuşdum. Eşitdim ki, Zeynəb imama belə deyirdi: Qardaşım dostlarını sınamısanmı? Olmaya çətinlikdə səni tək qoyalar? Həzrət, Zeynəbin cavabında belə buyurdu: Allaha and olsun, onları sınadım, onlar hamısı şücaətli, dilavər və möhkəmdirlər. Onların mənim yolumda ölümə olan həvəsləri .südəmər uşağın öz anasının sinəsinə olan həvəsi kimidir

Nafe deyir: Bu söhbəti eşitdim və ağlamaq boğazımı tutdu. Həbib ibni Məzahirin yanına gəlib eşitdiyimi ona söylədim. Həbib dedi: And olsun Allaha, əgər imamın hücum .fərmanını gözləməsəydik elə bu gecə düşmənə hücum edərdik

Nafe deyir: Həbibə təklif etdim ki, indi imam bacısı Zeynəbin xeyməsindədir. Bəlkə qadın və uşaqlar da oradadırlar. Yaxşı olar ki, sən bir az adam götürüb onların xeyməsinə get və öz vəfadarlığınızı bildir ki, onlar da rahat və arxayın olsunlar. Həbib uca səslə imamın dostlarını səslədi. Hamısı xeymələrdən çıxdılar. Həbib Bəni-haşimdən olanları xeymələrə qaytarıb, əhvalatı danışdı. Bütün səhabələr öz hazırlıqlarını elan etdilər. Həbib dedi: Gəlin, xanımların xeyməsinə gedib, onları arxayın edək. Xeymələrə çatanda isə, Həbib Bəni-haşim qadınlarına xitabən dedi: Ey

Peyğəmbər qızları və ey Allah Rəsulunun hərəmi! Bunlar sizin fədakar cavanlarınız, bu da onların parıldayan qılınclarıdır. Hamısı and içiblər ki, bu qılınclar sizin düşmənlərinizin boynundan başqa qına salmasınlar. Bu iti və uca nizələr də sizin qullarınızın ixtiyarındadır. Onlar da and içiblər ki, onları sizin düşmənlərinizdən başqa bir yerə sancmasınlar. Bu vaxt hərəm xanımlarından biri onlara cavab verdi: “Ey pak və mərd insanlar! Peyğəmbər qızlarını və Əmirəl-möminin ailəsinin qadınlarını müdafiə edin. Bu söz səhabələrin qulağına dəyən kimi hamısı uca səslə ağlayıb, hərəsi öz .xeymələrinə qayıtdılar

Zeynəb imam Hüseyn (ə)-ın dostları barəsində ona verdiyi arxayınlığı Aşura günü müşahidə etdi. Zeynəb gördü ki, onlar öz imamlarının qarşısında şəhid olmaq üçün bir-birindən qabağa düşmək üçün çalışırdılar. Gördü nə qədər ki, onların bir nəfəri belə sağdı, qardaşına heç bir zərər dəymir və gördü ki, yarım gün ərzində Əhli-beyt (ə) və .şiə məzlumiyyəti tarixinin əsla unudulmayacaq qanlı səhifəsi yaşandı

## SÜBH AÇILIR

Aşura gecəsi özünün son anlarını yaşayırdı. Bir gecə ki, imam və dostları üçün Allah münacatı və mənəviyyatla yanaşı Allaha qovuşmaq və dost görüşünün asudə və rahatlığı, sevinc və şadlığı ilə dolmuşdu. Bir gecə ki, ömər Səd və əsgərləri üçün iztirab, həyacan və nigaranlıq gətirmişdi. Sabah Peyğəmbər övladı ilə vuruşmaq lazımdırmı? Doğrudanmı imamı və onun dostlarını qətlə yetirməliyik? Bəs Allaha nə cavab verəcəyik? Görəsən Yezid, İbni Ziyad başqa Əməvi hökumət başçıları öz vədlərinə ?əməl edəcəklərmi

Hər iki cəbhə gecəni oyaq qaldı. Bir cəbhə sevinc, şadlıq və şəhadət eşqindən, o biri .cəbhə isə qorxu, iztirab və həyacandan yata bilmirdi

nəhayət sübh açıldı və imamın səhabələri bütün vücudlarıyla Allah düşmənləri ilə .qarşılaşmaq üçün özlərini hazırladılar

Əba Əbdillah səhabələrinin gecə yatmaq və istirahət əvəzinə namaz və Quran, Allaha istiğfar və münacatla keçirmələrinə baxmayaraq, onların cismi və fiziki gücü azalmamış, eşq onlara yeni güc və qüvvə bəxş etmişdi. Allah, Allah yolunda və Allahın

!Höccəti, zamanın imamı həzrət Hüseyn (ə)-ın qarşısında şəhadətə olan eşq

## EŞQ NAMAZI

İmam və səhabələr sübhi camaat namazı və Allah dərgahına dua və münacatla .başlayırlar. Bu namaz çoxları üçün son namaz olacaqdır: Eşq və vida namazı

Canlarını Allah yolunda qurban etməyə hazırlaşan bu ilahi insanların və xalis Allah .bəndələrinin bərpa etdiyi camaat namazının əzəmət və cəlalı yeri-göyü doldurmuşdu

səh:۲۷

İndiyə qədər heç bir səhabə üçün belə merac nəsib olmamışdı. nə gözəldir Aşura gününün Kərbəla çölündəki sübh namazı: İmamı Seyyüdüş-şühəda, məmumları isə :onun vəfalı dostları, imam Hüseyn (ə) Aşura gecəsində belə buyurmuşdu

.«Fəinni la ələmu əshabən ovfa vəla xəyrən min əshabi»

”.Mən öz səhabələrimdən yaxşı və vəfalı səhabələr tanımıram“

## İMAMIN SÖZÜ

Camaat namazı sona çatdı. İmam namaz qılanlara üz tutub, Allaha həmd-səna edərək .«buyurdu: «Allah mənim və sizin ölümünüzü bu gün üçün imza etmişdir

Ey kəramətli və böyük insanların övladları! Səbr edin. ölüm, sizi çətinliklərdən qurtarıb,“ geniş və əbədi behiştlərə çatdıran bir körpüdən başqa bir şey deyildir. Bəs sizin hansı biriniz zindandan qəsrə getmək istəmir? Bu ölüm sizin düşmənləriniz üçün isə qəsirlərdən zindan və işgəncələrə getmək deməkdir. Atam, Peyğəmbərdən nəql edirdi ki, o həzrət buyurub: «Dünya mömінin zindanı, kafirin öz cəhənnəmlərinə tərəf .«körpüləridir. nə yalan eşitmişəm və nə də yalan deyirəm

Beləliklə İmam (ə) səhabələrin qarşıdakı yollarını göstərmək, ölüm və dünya həqiqətlərini bəyan etməklə onların imanını möhkəmlədib qəhrəmanlıq və şücaət .dastanı yaratmaq üçün hazır etdi

# ÜÇÜNCÜ FƏSİL

## ZEYNƏB AŞURA HADİSƏLƏRİNDƏ

Zeynəb Aşura hadisələrində

Əliəkbərin cənazəsi kənarında

Zeynəb övladlarından şəhid

Eşqin nümayişi

Aram və dözümlü olmağın sirri

Əhli-beytlə vida

İmamın son istəyi

İmam (ə)-ın şəhadəti

Zeynəbin fəryadı və düşmənin daş qəlbi

Ürək ağrıdan xəbər

Hadisədən sonra

Düşmənin qarət və talanı

Əzizlərinin cəsədi kənarında

İmam Səccad (ə)-ın müdafiəsi

səh:۲۸

Məni də onunla öldürün

İmam Səccad (ə)-a tibbi yardım

Zeynəbin imamı sakitləşdirən sözləri

Döyüş başlanır. Kərbəla çölünü dolduran hadisələr, burulğanlar bir-birini əvəz edir. Hər qəhrəmanlıqdan sonra yeni bir qəhrəmanlıq, hər şəhadətdən sonra yeni bir dərd gəlir. Zeynəb bu meydanın tamaşaçısıdır. Sözsüz ki, bu səhnələr onu incidir, hər biri yeni bir dərd olur. Vəfalı Hüseyn bacısının qəlbini ağrıdan və belini sındıran da məhz bu .səhnələr idi

Toz-torpaq kimi üstünə səpələnən bü müsibətlər Zeynəbə nüfuz edib onu yolundan azdıra, islam və imamına olan təəssübünü qıra bilmirdi. çünki, o, Əli qızı və onun səbr məktəbinin davamçısıdır. Bütün yeri-göyü və Allah mələklərini ağlar qoyan, hamını matəmə qərq edən Kərbəla faciələri, əzəmətli və böyük Zeynəb ruhunu sındıra bilmədi. Dərd və müsibətlər odlu oxlar kimi onun qəlbinə sancılıb, qana boyadı, lakin .canında olan eşq və ruhi böyüklük onu eləcə, möhkəm saxlamışdı

Hələ Zeynəb yolun əvvəlindədir. Qarşıda aləmin ən böyük qəm-qüssələri ilə dolu uzun bir yol vardır. Bu uzun yol, Əməvi hökumətinin kin və düşmənçiliyi ilə dolu mənfur viranəlikdən ibarətdir. O, elə məhz bu yolları keçməli və qanlı Kərbəla hərəkatının [qalibiyyət] bayrağını tarixə təqdim etməlidir. Gərək elə bir karvana başçılıq etsin ki, hamısı Kərbəla qaranquşları və Aşura yadigarlarıdır. Bu qandallı məzlumların macərası .isə, bu xülasəyə sığmayan geniş bir dastandır

Aşura hadisələrinin çoxu Zeynəbə dəyən müsibət sillələri olmasına baxmayaraq, biz bu kitabda müraciət edib, Zeynəbin birbaşa iştirakı olan səhnələri təsvir etməyə çalışacağıq. Bununu üçün də geniş Kərbəla tarixindən bir neçə səhnə haqqında söhbət .açacağıq

## ƏLİƏKBƏRİN CƏNAZƏSİNİN KƏNARINDA

İmam Hüseyn (ə)-ın qeyrətli oğlu Əliəkbər onun başqa övladları arasında həzrət Peyğəmbərə daha çox oxşayırdı. Onun nurlu çöhrəsi, pak təbiəti və gözəl əxlaqı

Zeynəb və Seyyidüş-şühədanın əziz babası həzrət Peyğəmbəri xatırladırdı. Heç şübhəsiz ki, bu xüsusiyyətlər Zeynəbin ona Allah Rəsulunun bu pak sülaləsinə olan məhəbbət və bağlılığını daha da artırmışdı. Bütün bunlar onu, Əliəkbərin imamı .ağladan ağrılı-acılı şəhadətində qardaşına şərik etdi

İmamın səhabələri şəhadətə çatmayınca Əhli-beytdən heç kimi meydana buraxmadılar. Bütün səhabələr şəhid olandan sonra Əhli-beytdən meydana gedən ilk .döyüşçü imam Hüseyn (ə)-ın böyük oğlu Əliəkbər idi

Əliəkbərin gözəlliyi, əxlaqı fəzilətləri və digər xüsusiyyətləri məşhur idi. Bu vilayət mövludunun əsl vəsfini İmamın (ə) dilindən eşidək. İmam Hüseyn (ə) oğluyla vidalaşan zaman onun gözəl üzünə və uca qamətinə məhəbbət dolu nəzər salaraq, üzünü göyə :tutub buyurdu

Əllahümməşhid əla haulail qovmə qəd bərəzə iləyhim ğülamun əşbəhunnasi xəlqən»
.«və xulqən və məntiqən bi rəsulikə. Kunna izəştəqna ila nəbiyyikə nəzərna ila vəchihi

İlahi, şahid ol ki, xilqətdə, əxlaqda və danışıqda Peyğəmbərinə ən çox oxşayan cavan“
”.onlara tərəf gedir. Bir cavan ki, Peyğəmbər üçün darıxanda onun üzünə baxırdıq

.Təbii ki, belə bir övladdan ayrılmaq imam Hüseyn (ə) üçün heç də asan deyildi

Heç bir tarix kitabında görünməmişdir ki, imam Hüseyn (ə) Əliəkbərdən başqa bir nəfər üçün ağlamış olsun: Vidalaşan zaman, meydandan qayıdıb atasından su .istəyəndə və doğranmış bədəni yanında

Seyyüdüş-şühədanın dilavər oğlu meydana gedir. Yorğunluq və möhkəm susuzluqla yanaşı düşmənə çoxlu zərbələr endirir. Sonra, aldığı çoxlu yaralarla atasının yanına gəlib su istəyir: İstəyir ki, su içib, düşmənə qarşı yeni qüvvə ilə vuruşsun. İmam Hüseyn (ə) ağlayıb deyir: “Oğlum, get meydana. Tezliklə cəddim Rəsulullahın əlindən ”.su içəcəksən

Əliəkbər yenidən meydana gedir. Amma bu dəfə çox keçməmiş onun səsi ucalır. O, atası ilə vidalaşırdı. İmam Hüseyn (ə) özünü meydana çatdıraraq oğlunun cəsədi yanında üzünü onun üzünə qoyub buyurdu: Allah səni öldürənləri öldürsün. Səndən .sonra kül olsun dünyaya və onun həyatına

İstəkli övladının müsibətinə İmamın ürəyi yanır, göz yaşı tökür. O vaxtacan heç kim .imam Hüseyn (ə)-ın ağlamaq səsini eştməmişdi

Zeynəb hər şeyi görür və qardaşının ağlamasını eşidirdi. Qəzəb və nifrət qəhri boğazını tutduğundan, qəm ürəyinə ağırlıq edir, qardaşının ağlar səsi isə canına od salır. Qəmli sifətlə tələsik xeymədən çıxıb Əliəkbəri “Ey əziz, ey əziz qardaş oğlum” – deyə novhəylə çağırırdı. Tez özünü ona çatdırır. Onu qucaqlayır ki, qəlbi təskinlik tapsın və dərdələri sakitləşsin. Amma neyləmək ki, bu ağır müsibətə də dözmək məcburiyyətindədir. Qardaşı imam Hüseyn (ə) ona toxtaxlıq verərək, oğlunun cəsədi .başından qaldırıb xeymələrə tərəf qaytarır

Beləliklə, Zeynəb çox sevdiyi bir əzizini əldən verir və bununla da onun dağlı sinəsinə

daha böyük dərd əlavə olunur. Bundan az və yüngül müsibət hər bir insanı təslim etməkdə kifayət idi. Lakin, Zeynəb üçün bütün bunlara dözməyi asanlaşdıran, onun islama və zəmanənin imamına təəssübü idi. O, yalnız ilahi vəzifəsini düşünür, Allahın məsləhəti və imamının fərmanına tabe olurdu. Elə bütün bunlar Zeynəbə səbr, dözüm və arxayınlıq bəxş edir, pak əqidəsi, xalis imanı və mənəvi qüdrəti, sonacan onu .möhkəm və dözümlü saxlayırdı

## ZEYNƏB ÖVLADLARINDAN ŞƏHİD

Məlum olduğu kimi, Zeynəbi-Kubranın əri Əbdullah ibni Cəfər, imam Hüseyn (ə) Məkkədən çıxarkən, o Həzrətə bir məktub yazıb, oğulları Məhəmməd və Ounu məktubla birgə İmamın yanına göndərdi ki, ona qulluq etsinlər. Bu iki nəfər Kərbəla

vaqiyəsində iştirak etmiş və hər ikisi şəhid olmuşlar. Məhəmməd haqda dəqiq məlumat olmasa da, qəti surətdə məlumdur ki, Oun, Əbdullahın həzrət Zeynəbdən .olmuş oğludur

Aşura günü Məhəmməd şücaətli bir döyüşdən sonra şəhid oldu. Ondan sonra isə, :qardaşı Oun döyüşə hazırlaşır və bir rəcəz oxuyaraq özünü belə təqdim edir

Əgər məni tanımırsınızsa, mən Cəfərin – həqiqi şəhidin oğluyam ki, behiştdə“ parıldayaraq, yaşıl qanadlarla uçacaqdır. Məhşər günü şərafət üçün isə elə bu qədər .”kifayətdir

Sonra düşmənə hücum edib, atlılardan üçünü piyadalardan isə on səkkizini .öldürdükdən sonra şəhadətə yetişir

Zeynəbin oğlu Ounun şəhid olduğu vaxt yaşı haqda dəqiq məlumat yoxdur. Amma, Seyyid Mürtəzanın onun üçün nəql etdiyi bir ziyarətnamədən məlum olur ki, yeniyetmə olmuşdur. çünki, o ziyarətnamədə belə oxuyuruq: “Salam olsun sənə, ey Oun ibni Əbdullah ibni Cəfər ibni Əbu Talib! Salam olsun sənə, ey Peyğəmbər qucağında böyümüş və onun əxlaqına iqtida edənin oğlu! Və salam olsun sənə ki, yeniyetmə vaxtında, hələ bədəni güclənib, möhkəmlənməmiş Peyğəmbər hərəmini müdafiə etdin, arxayın qəlb və aram ürəklə düşmən nizələrinin istiqbalına getdin və !nəhayət ən yaxşı əməllə Allaha qovuşdun

Zeynəb (s)-ın öz şücaətli oğlu Ounun şəhadətini necə qarşılaması tarixdə qeyd olunmamışdır. Amma, Zeynəb kimi insandan bu müsibətin qarşısında da yalnız səbr gözləmək lazımdır. övlad şəhadəti, onun üçün Seyyidüş-şühəda və onun övladlarının şəhadəti qarşısında çox asandır. çünki, Zeynəbin nəyi olsa da, o, özünü Hüseyn (ə) yolunun fədaisi bilir. O, həqiqətən də vilayətə etiqadlı idi və «Ənnəbiyyu ovla bil mömininə min ən fusihim» ayəsinin mənasını çox gözəl başa düşürdü. Bilirdi ki, Peyğəmbər (s) övladlarını hər şeydən, hətta öz canı və övladlarından da üstün .tutulmalıdır

**EŞQİN NÜMAYİŞİ**

Aşura gününün hər anı, Allah yolunda fədakarlıq və mübarizənin ən böyük

qəhrəmanlarını özüylə meydana aparır. Seyyüdüş-şühədanın səhabə və köməkçiləri bir-bir eşq və isarın ən əzəmətli səhnələrini tamaşaya qoyur və Kərbəla çölünü elə kişilərin canfəşanlıqlarının tamaşasına çevirir ki, onlardakı vəfa və paklığın misli tarixdə görünməmiş və görünməyəcəkdir. Belə bir tamaşa və Zeynəb kimi bir tamaşaçı ki, hər şəhadət ürəyinə bir dağ qoyur, yalnız qamətinə müsibət zərbəsi endirir. Lakin, bu zərbələr onun müqavimət və möhkəmliyi qarşısında sınır, aram, .böyük ruhuna baş əyir

Və indi Zeynəb Əhli-beytin məzlumiyyəti və yezidlərin alçaqlığı üçün fəryad qoparan .ən acı səhnələrdən birinə şahiddir

.İmam Hüseyn (ə) son anlarda Zeynəbin xeyməsinin yanına gəlir

.Bacı, kiçik uşağımı mənə ver, onunla vidalaşım

Zeynəb qardaşının südəmər oğlunu ona verir. Susuzluğun əldən saldığı bir südəmər körpənin halını kim təsvir edə bilər? Və kim ağır müsibətlərdən sonra kiçik uşağının öldürücü susuzluğu və qızdırmasına baxan bir atanın halını doğru-düzgün təsəvvür ?edə bilər

Ata, belə susuz bir körpə ilə necə vidalaşsın? Vidalaşmaq üçün onu öpməkdən başqa bir yolu varmı? Amma, atanın dodaqları uşağın hərəkətsiz üzünə çatmamış düşmən Hərmələnin oxu onun kiçik boğazını deşib, qəmli Kərbəla torpağına qan toxumu səpir. Bir ərəb şairinin təbiriycə desək, düşmənin oxu uşağın boğazını Hüseynin .dodaqlarından tez öpür

İmam Hüseyn (ə) uşağı Zeynəbə qaytarır. Hər iki əlini körpənin boğazının qanı ilə :doldurub, göyə səpir və bu gözəl kəlamı buyurur

.«Hovnun ələyyə ma nəzələbi ənnəhu bi əynillah»

Mənə nə (müsibət və çətinlik) olsa asandır. çünki, Allah onu görür və bütün bunlar,“ ”.onun gözləri qarşısındadır

”.İmam Baqir (ə) buyurmuşdur: “O qandan bir damcıda da yerə qayıtmadı

Əliəsgərin atasının qucağında acı şəhadət səhnəsi çox ağır və təsirli ola bilərdi, amma bütün bunları asanlaşdıran yalnız imam Hüseyn (ə)-ın eşqi idi. Aşura – Allaha eşq günü, .Kərbəla isə Hüseynin öz Allahı ilə ən böyük eşq meydanıdır

Seyyüdüş-şühəda (ə) hər şeyini öz məşuquna qurban etmək üçün meydana gətirilmişdi və bütün bunları özünə asan bilirdi. çünki, o, öz məhbub və məşuqunu öz .yanında və hadisələrə şahid bilirdi

## ARAM VƏ DÖZÜMLÜ OLMAĞIN SİRRİ

Bəlkə də imam Hüseyn (ə)-ın südəmər körpəsinin şəhadət səhnəsi, Zeynəbin Aşura günü öz gözləri ilə gördüyü ən qəmli səhnələrdən biri idi. Amma, Zeynəbi möhkəm saxlayan, ona aramlıq və arxayınlıq verən, dözümünü artıran və Hüseyn (ə) yolunun davamına hazırlayan Seyyüdüş-şühədanın müsibəti vaxtı dilinə gətirdiyi sözlər idi.

Allahın işi qarşısında razılıq və təslimçilikdən dolu bir ürəkdən axan bu sözlər ixtiyarsız .olaraq Zeynəbin pak qəlbinə oturmuşdu

.«Hovnun ələyyə ma nəzələbi ənnəhu bi əynillah»

Seyyüdüş-şühəda bu qısa cümləylə bir dünya mərifət, tovhid, iman, təvəkkül, təslim və razılıq nümayiş etdirirdi. Zeynəb də qardaşının göyün mələklərini təəccübə gətirən .səbrindən ilham alır. öyrənir ki, ən ağır dərd və əzablar da Allah yolunda asandır

Doğrusu haqqa və Allah hüzurunda vəzifə icraçısına olan eşqdən savayı hansı etimad yeri imam Hüseyn (ə)-ın və bacısı Zeynəbin ruhuna aramlıq bağışlaya bilər?! İndiyə qədər şəhid və ya əlil olmuş, zərər çəkib, müsibət görmüş insanların anaları, bacıları, həyat yoldaşları, qohumları, uşaqları Aşura tarixinin bu zirvəsi barədə düşünüblərmi? Təsəvvür ediblərmi ki, Əliəsgərin üzücü şəhadət səhnəsi nə qədər

ağır və çətindir. Doğrusu, nəyə görə Hüseyn və Zeynəb bu qədər aramdırlar? Belə deyilmi ki, onlar Allahın razılığını hər şeydən önə salıb, öz ürəklərini Allahın zikri ilə .aram edir və özlərini Allahın qarşısında bilirlər

## ƏHLİ–BEYTLƏ VİDA

İmam Hüseyn (ə) öz ətrafına baxır. Bütün səhabə və köməkçiləri şəhadətə çatıblar. O, ən yaxşı və vəfalı insanlardan ibarət olan Əhli-beyti ilə vidalaşmaq üçün xeymələrə sarı gedir. Əhli-beytin ən əziz və ən istəkliləri olan Hüseyndən ayrılmaq onlar üçün necə də ağırdır! çox çəkməyəcək ki, Allahın ən yaxşı məxluqu və özlərinin ən böyük .hamilərini Kərbəlanın isti torpaqları üzərində görəcəklər

Bu ayrılığın İmam (ə)-a Əhli-beytdən hansı biri üçün daha çətin olmasını söyləmək olmaz. Lakin, bu iddianı etmək olar ki, bu, tarixin ən dərdli vidası olmuşdur. İmam Hüseyn (ə) nida edir: «Ey Səkinə! Ey Fatimə! Ey Zeynəb! Ey Ummu Gülsüm! Salam olsun sizə! Bu görüşün son anlarıdır!» İmamın istəkli qızı Səkinə qışqırır. Ey ata! ölümə ?gedirsən? İmam buyurdu: Heç bir dostu, köməyi olmayan şəxs, necə ölümə getməsin

.Sonra Əhli-beyt qadınları şivən edir və İmam (ə) onları sakitləşdirir

İmam (ə) Səkinəni çox sevir. Onu sinəsinə sıxıb, gözlərinin yaşını silir və buyurur: “Ey Səkinə, bil ki, məndən sonra çox ağlayacaqsan, amma hələ ki, bədənimdə can var, göz ”!yaşlarınla məni həsrətdən ayırma

Aşura günüdür. İmam Hüseyn (ə) anbaan öz məbudunun görüşünə yaxınlaşır. Köməkçi və müdafiəçilərindən, daha heç kəs qalmamışdır. İmamın mübarək bədəninin çoxlu yarası vardır. Susuzluq onu çox zəiflətmiş, əzizlərinin dağlı ürəyini sındırmışdır. Qardaşı Əbbasın şəhadəti onu hər şeydən daha çox kədərləndirmişdir və Hüseyn (ə) düşmənin zahiri baxışında tənha və yalqızdır. Lakin, bütün bunlarla yanaşı, onun qəlbi arxayın və aramdır. O, dodaqaltı və batində öz Allahı ilə danışır, aşiqanə pıçıldayır. Düşmən özü də etiraf edir ki, müsibət və təzyiqlər onun səbr və müqavimətini .azaltmamışdı

.Hər an şəhadətə yaxınlaşdıqca imam Hüseyn (ə)-ın çöhrəsi daha şad və işıqlı görünür

Bu təklik hərəm xanımları və uşaqları üçün çox ağırdır. necə dözmək olar ki, yer üzünün ən əziz və şərafətli insanı, Allahın höccəti heç birköməksiz düşmən !?mühasirəsində qala

Bu vaxt imam Hüseyn (ə)-ın kiçik oğlu Əbdullah xeymələrin arasında idi. O, əmisinin tənhalığını görüb, ixtiyarsız olaraq xeymədən çıxır. Tələsik özünü düşmənlərin arasına salır. Zeynəbi-Kubra, hərəm xanımları və uşaqlarından çox muğayatdır və öz imamının fərmanını yerinə yetirir. Amma, deyəsən qardaşının başına gələnlərin ağırılığı, ona hər şeyi unutdurmuşdur. O, birdən görür ki, Əbdullah Hüseyn (ə)-a tərəf qaçır. Zeynəb sürətlə onu təqib edir. İmam Hüseyn (ə)-da əmr edir ki, Zeynəb onu saxlasın. Amma, ,Zeynəb bir şey edə bilmir. Əbdullah and içir ki

əmimdən ayrılmaram. Bu vaxt düşmənlərdən biri İmama qılınc çəkir. Əbdullah öz qolunu düşmənə qalxan edir. Qılınc zərbəsindən qolu möhkəm zədələnib dəridən asılı qalır. Uşaq qışqırır. İmam onu qucaqlayıb dözməyini istəyir. Birdən Hərmələ, ona tərəf bir ox atıb, Əbudullahı İmamın qucağında şəhadətə yetirir. Zeynəb isə eləcə səhnəyə .baxır. Dağ üstə dağ, səbr üstə səbr

## İMAMIN SON İSTƏYİ

Kərbəla və Aşuranın iki cəhəti vardır. İnsaniyyət, kamal və fəzilət zirvələrini göstərən cəhət Seyyüdüş-şühəda cəbhəsində yaranmışdır. Bu qanlı çöhrədə iman, cihad, eşq, isar və bütün yaxşılıqlar görünür. Digər üzündə isə rəzalət və alçaqlığın son həddi .vardır

Düşmən cəbhəsinin rəzalət və əyriliyini sübut edən səhnələrdən biri, imam Hüseyn (ə)-ın köhnə paltar istədiyi səhnədir. İmam onu altdan geymək istəyirdi ki, şəhid olandan sonra, daha düşmən onları da qarət etmək fikrinə düşməsin. O həzrət üçün .dar paltar gətirdilər. Həzrət buyurdu: Bu zillət libasıdır. Başqa bir paltar gətirdilər

:İmam fəzilət nümunəsidir. O, izzətlidir və heç vaxt zillətə boyun əyməz. Onun şüarı

.«Heyhat minnəz-zillət»

.Heyhat, alçaqlıq bizdən uzaqdır" sözləri"

İmamın istədiyi son paltarı kimin gətirdiyi tarixdə qeyd olunmamışdır. Amma, güman .etmək olar ki, o, Zeynəb olmuşdur. çünki, İmama ən yaxın adam o idi

O, İmamın sözlərini xeymələrə çatdıran və onunla Əhli-beyt arasındakı rabitəçi idi. Onun bir qulağı hərəm əhlinin "Əl-ətəş" nalələrində, o biri qulağı isə döyüş meydanında, Hüseyn (ə) səsindədir. Bir gözünü xeymələrə, o biri gözünü isə Hüseyn (ə) tərəf dikmişdir. O, Zeynəbdir, Hüseyn bacısı və onun istəyəni. Onun cismi xeymələrdə, qəlbi isə Hüseynlədir. Hüseyn (ə)-ı xatırlamaqla ürəyi sakitləşir. çünki, Hüseyn varlıq dünyasının aramlığı, Allahın höccətidir və yer-göy hamısı onun vücudu .ilə aramdırlar

İmam, düşmənin pisliyinə agahdır. Köhnə paltar istəyir və bundan əlavə onun neçə yerini cırır ki, tamamilə dəyərsiz olsun. Sonra onu paltarlarının altından geyir. Amma, .düşmən o qədər alçaqdır ki, bu tədbirlər onu fikrindən daşındırmaz

.«Fələmma qətələ cərrəduhu minhu»

İmam şəhadətə yetişən kimi həmən köhnə paltarı da mübarək bədənindən“ .çıxartdılar

„Paltarının altından köhnə libas geyindi ki“

.rəzil və alçaq düşmən onu da əynindən çıxarmasın

?Axı atların dırnağı altında paltara nə ehtiyac var

.Daha bədən qalmadı ki, paltar və ya kəfənlə örtsünlər

## İMAMIN ŞƏHADƏTİ

Kərbəla çölü, tarixin ən böyük hadisələr yatağı, Aşura isə bəşəriyyət və varlıq aləminin ən acı və qəhrəman günüdür. Yer və göyü, aləmin mələk və mövcudlarını ağladan bir hadisə sona çatır. Qan göydən yağıb, yerdən qaynayır. Səma qaralır, qırmızı küləklər əsir və üfüq qan içində batır. İnsanlar əzab gözləyirlər. Peyğəmbərin vəfatından sonra ən böyük müsibətlərdən biri Əhli-beytə üz tutur. İmam Həsən (ə)-ın sözü ilə desək: .Aləmdə onun kimi bir gün yoxdur

İmam Hüseyn (ə) qaynar Kərbəla səhrasında susuz dodaqla və iman dolu qəlblə .qaniçən düşmən ordusunun qarşısında dayanır

Əbdullah ibni Əmmar ibni Həcus deyir: Mən çoxlu düşmən hücumuna məruz qalan heç bir məğlubu, Hüseyn ibni Əlidən daha möhkəm qəlbli, arxayın və aram ürəkli, sabitqədəm görməmişəm. Onun bütün övladları, qohum və dostları qətlə yetirildiyi halda belə! Belə vəziyyətdə o, düşmənə hücum edəndə döyüşçülər onun qabağından .qaçır, pərən-pərən düşürdülər

ömər ibni Səd qoşun üzvlərinə qışqırırdı: Bu Ənzəi Bətin (Əli ibni Əbi Talib) oğludur! Bu, !ərəbləri öldürənin oğludur! Onu mühasirə edib hər tərəfdən ona hücum edin

.nəfər ox atan onu əhatə edirlər. Və onunla xeymələrin arasını bağladılar ۴۰۰۰

.Həzrət Seyyüdüş-şühəda fəryad etdi

Ya şiətə ali əbi Süfyanə! İnləm yəkun ləkum dinun və kuntum la təğamunəl məadə » .«fəkunu əhrarən fi dunyakum! Vərciu ila əhsabikum in kuntum urbən kəma təzumun

Ey Əbu Süfyan davamçıları! Əgər sizin üçün bir din yoxdursa və məaddan da » qorxmursunuzsa, heç olmasa dünya həyatınızda azad olun. Və əgər düşündüyünüz («!kimi, ərəb tayfasındansınızsa öz əcdadınıza qayıdın (və namərd işlərdən uzaq olun

?Şimr, Həzrəti səslədi ki, ey Fatimə oğlu nə deyirsən

Düşmən hamılıqla Həzrətə tərəf üz tutdu. Vuruş şiddətləndi və həzrətin susuzluğu .çoxaldı

İmam ikinci dəfə vidalaşmaq üçün xeyməyə gəldi və hərəm əhli ilə vidalaşdı. Sonra isə :mübarizə mərkəzinə qayıtdı. O, çox-çox deyirdi

.«La hövla və la qüvvətə illa billah»

".Allah-təalasız heç bir hərəkət və dəyişiklik, qüvvə və qüdrət yoxdur"

səh:۳۵

Əbul Hətuf Cofi mübarək alnına bir ox vurdu. Həzrət onu çıxartdı, qan üzünə axdı və dedi: “Pərvərdigara! Sənin sözə baxmaz bəndələrin tərəfindən mənə yetişən bu .halıma agahsan

İlahi, bir-bir onları say! Onları ayrı-ayrılıqda həlak elə! Onlardan birini də yer üzündə !qoyma! Və heç vaxt onları bağışlama

Bu halda, dəymiş yaraların çoxluğundan, Həzrət o qədər zəifləmişdi ki, aram olmaq üçün dayandı. Amma bir kişi alnına daş vurdu, qan üzünə axdı. öz paltarı ilə qanı .gözlərindən silmək istəyəndə başqa bir kişi üç guşəli oxla mübarək qəlbini hədəf seçdi

:Peyğəmbər övladı Allaha ərz etdi

Bismillahi və billah və əla milləti Rəsulillah. Və rəfəə rəsəhu iləs-səmai və qalə: İlahi» .«innəkə tələmu ənnəhum yəqtülunə rəcülən leysə əla vəchil ərzi ibni nəbiyyin ğeyruhu

Allahın adı və özüylə, Allah Rəsulunun milləti və dini xatirinə (bu şəhadət mənə nəsib! olur).” Başını göyə tərəf qaldırıb, dedi: “Mənim Allahım! Sən bilirsən ki, bu insanlar bir ”!kişini öldürürlər ki, geniş yer üzündə ondan başqa Peyğəmbər övladı yoxdur

.Əl atıb belindən oxu çıxartdı. Qan havadan axan su kimi axırdı

Həzrət, əlini qanın altına tutdu. Dolandan sonra isə, göyə səpib buyurdu: “Bu hadisə .”Allahın gözləri qarşısında olduğu üçün, mənə olduqca asan və qorxusuzdur

.O qandan bir damcı da yerə tökülmədi

Sonra ikinci dəfə əlini qanın altına tutub, doldurdu. Onunla baş, üz və mübarək saqqalını qana boyayıb dedi: “Allahla və cəddim Peyğəmbərlə görüşənədək elə bu .”halda qalacağam

Onun mübarək bədənindən o qədər qan axmışdı ki, daha qüvvəsi qalmamışdı. Yerin üstündə oturub, çətinliklə başını yuxarıda saxlayırdı. Bu vaxt Malik ibni Bosr gəlib .Həzrətə söyüş verdi və qılıncla başına zərbə endirdi

Dəbilqə – yəni Həzrətin başında olan hündür papaq qanla doldu. Həzrət dəbilqəsini

.atdı və adi baş örtüyünün üstündən əmmamə, bəzilərinə görə isə dəsmal bağladı

Zürət ibni Şərik o Həzrətin sol çiyninə zərbə endirdi. Həsin Həzrətin boğazını oxladı. Bir başqası mübarək boynuna zərbə vurdu. Sinan ibni Ənəs nizə ilə əvvəlcə sinəsinin .üstünə, sonra isə boğazına bir ox batırdı. Saleh ibni Vəhəb də böyründən oxladı

Hilal ibni nafe deyir: Hüseyn can verəndə mən onun yaxınlığında durmuşdum. And olsun Allaha, ömründə bütün bədəni qana boyandığı halda, Hüseyn kimi gözəl üzlü və nurani sifətli qətlə yetən görmədim. And olsun Allaha onun, üzünün nuru məni onu .öldürmək fikrindən daşındırdı

O cür ağır və çətin halda gözlərini göyə tutub, Həzrət Rəbbi-Zülcəlalın dərgahına duada ərz edirdi:

«Səbrən əla qəzaikə ya Rəbbi, la ilahə sivakə ya ğiyasəl mustəğisin».

“Sənin təqdiratın və fərmanın qarşısında səbr edib dözürəm, İlahi! Səndən başqa Allah yoxdur, ey ona sığınanların pənahı!

Həzrət Məhəmməd Baqir (ə)-dan rəvayət olunmuşdur ki, həzrətin atı uca səslə kişnəyir, alnını həzrətin qanına bulaşdıraraq qoxulayır və dilə gəlirdi: “Fəryada yetiş! Fəryada yetiş bir ümmətdən ki, öz Peyğəmbərlərinin qızını və oğlunu öldürürlər.”

Sonra hərəm xeymələrinə fikir verdi:

Ummu Gülsüm fəryad edirdi:

«Va Muhəmməda, və Əbəta, və Əliyya, va Cəfəra, va Həmzəta».

“Bu Hüseyndir ki, Kərbəlanın quru biyabanında yerə düşüb.”

## ZEYNƏBİN FƏRYADI VƏ DÜŞMƏNİN DAŞ QƏLBİ

Tarixin ən həyacanlı cinayətinə tamaşa edən Zeynəb, ürək yanğısı ilə fəryad edirdi:

«Va əxa, va seyyida və əhlə bəyta, leytəs-səmaə ətbəqət ələl ərzi və leytəl cibalə tədəkdəkət ələs-səhli».

Kaş göy yerə gələydi, kaş dağlar əzilib, çölləri dolduraydı. Qardaşının yanına gəldi. Gördü ki, ömər ibni Səd adamlarından bir dəstə ilə Həzrətə yaxınlaşmışlar. Qardaşı Hüseyn can verirdi:

«Fəsahət ey ömər əyuqtəlu Əbu Əbdillah və əntə tənzuru iləyh».

“Ey ömər ibni Səd! Əbu Əbdullahı öldürürlər, sən ona baxırsan?

ömər üzünü çevirdi. Göz yaşları saqqalına axırdı. Zeynəb fəryad etdi:

«Və yəhkum əma fikum muslim?»

?Vay olsun sizə! Aranızda bir nəfər də müsəlman yoxdurmu“

Heç kəs cavabını vermədi. ömər ibni Səd qışqırdı: Atlardan düşün Hüseyni rahat ...buraxın

Yer üzü Allahın üçüncü höccətindən məhrum oldu. Toz və qaranlıq səmanı bürüdü. Qırmızı külək əsdi və hava bir müddət beləcə qaranlıq oldu. Biri başqasını görmür və .hamı əzab gözləyir

səh:٣٧

### ÜRƏK AĞRIDAN XƏBƏR

Sonra ölüm mələyi cəddin Rəsulullahın qəbri yanında dayandı, göz yaşı tökməklə sənin ölüm xəbərini ona çatdırdı və dedi: Ey Allahın Rəsulu, qızının oğlu və mərd övladın .şəhid oldu, itrət və ailənə pis hadisələr üz verdi

Bu xəbəri eşidəndən) sonra Peyğəmbər qəmgin və pərişan oldu, dərdli qəlbi ağladı.) Mələk və Peyğəmbər (sənin müsibətin xatirinə) ona başsağlığı verdilər. Anan Zəhra (sənin müsibətin kədərindən) dərd-qəm etdi. Müqərrəb mələklər get-gəldə idilər və atam Əmirəl-mömininə başsağlığı verirdilər. “Əla illiyyətində sənin üçün əza və matəm üz-başlarına vurdular. (Sənin matəmində) asiman və onun sakinləri, cənnətlər və gözətçiləri, dağlar və yamacları, dəniz və balıqları, bağlar və cavanları, Kəbə evi, .”İbrahim məqamı, Məşərül-həram, həcc və hərəm hamısı ağladılar

### HADİSƏDƏN SONRA

Həzrət Əba Əbdillahın ürəkyandıran şəhadətindən sonra Əhli-beyt qadın və uşaqlarının qorunması və işlərinin idarəsində Zeynəbin məsuliyyət və çətinlikləri daha da artdı. Peyğəmbər xanədanına üz verən dərdli anlar, saatlar və günlər vəsfə .gəlməzdir

Və Zeynəb bu saysız çətinliklərə hamıdan artıq dözməlidir ki, o əzəmətli karvanı .istənilən mənzilə yetirsin

Deməh olar ki, müsibət yükü və acı hadisəlrin çoxu Aşura günü günortadan sonrakı anlarda idi. Bu hadisələr bir-birinin ardınca, dəhşətli tufan kimi Əhli-beytə üz tuturdu. İmamın onların istəklərinin qarşısında təslim olmamasından qəzəblənən və qarşı tərəfdən heç bir müqavimət görməyən düşmən isə, hər növ cinayət və talançılığı .mümkün bilir və heç bir vəhşilikdən çəkinmir

### DÜŞMƏNİN QARƏT VƏ TALANI

O namərdlər Peyğəmbər xanədanı və Zəhranın gözlərinin nuru xeymələrini talan .etməkdə bir-birlərindən qabağa düşməyə çalışırdılar

Onlar xanımların başından çadraları çəkirdilər. Peyğəmbər qızları və onun bütün Əhli-

.beyti ağlayır, öz əziz və hamilərinin ayrılığına nalə və fəryad edirdilər

Ravi deyir: O namərdlər qadınları çıxarıb, xeymələri odladılar. Başı açıq və ayaq yalın .xanımlar isə ağlaşaraq xeymələrdən çıxıb, düşmənin əsirinə çevrildilər

Bəli! Bu əsir düşmüş əzizlər və əzizlərini əldən vermiş müsibət sahiblərinin dastanı elədir ki, daş ürəkləri əridir və insanın gözlərindən yaş axıdır. Haradadır Əhli-beyt himayəçiləri? Haradadır Peyğəmbər xanədanının müdafiəçiləri? Haradadır Hüseyn dostları? Hanı Əbbas, hanı Əli? Hanı Seyyidüş-şühəda ki, gəlib Peyğəmbər, Fatimeyi-.Zəhra və Əliyyi-Mürtəza övladlarının himayə etsinlər

Əhli-beyt əsirləri hərəkət vaxtı düşmənə and verdilər ki, onları Hüseyn qətligahından aparsınlar. Bəlkə onları görmək ürək yaralarına məlhəm ola. Ürəklərini boşaldıb, hicran qəmi dastanını əzizlərinə söyləsinlər ki, müsibət yükləri yüngülləşib, ürəkləri bir .qədər sakit olsun

Əzizlərinin qana bələşmiş cəsədlərini və tikə-tikə olmuş bədənlərini görəndə isə, taqət gətirməyib, ürəklərini əldən verdilər. Ürək dağları təzələndi, canları odlandı, göz .yaşları axdı və hər tərəfdən nalə və şivən ucaldı

Əhli-beytin əzizlərinin ölü bədənləri ilə görüşü o qədər qəmli və kədərli idi ki, dost və .düşmənin ağlamasına səbəb oldu

Bu ilk əzadarlıq məclisi idi ki, qətligahda, Seyyidüş-şühədanın pak bədəni yanında .bərpa oldu və tarixdə belə qəmli və yanıqlı məclis qurulmamışdır

Bu arada Zeynəbin naləsi daha sarsıdıcı və ürək yandırandır. Zeynəb qanına qəltan və bədəni tikə-tikə olmuş qardaşının başı üstündə üzünü Mədinəyə çevirib ata-anasını, baba və əcdadını səsləyir, yüz ah və yanğı ilə ürək səhifəsi açır. O ən isti hiss və duyğularını inkar etməklə yanaşı, özünün təbliğ vəzifəsini də unutmur. özünü və iftixarlı ailəsini, Peyğəmbər, Əli, Fatimə və Həmzəni tanıtdırır və dünyaya bildirir ki, belə bir xanədan heç vaxt zillət qəbul etməz. O böyük qadının qəmli nəğməsini düşmən cəbhəsinin rəsmi yazarı Həmid ibni Müslümün dilindən eşidək: And olsun Allaha, unutmaram ki, Əli qızı Zeynəb ağlayır, dərdli avaz və qəmli qəlblə deyirdi: Ey Məhəmməd! Göyün mələkləri sənə salam göndərir. Bu qanlı və tikə-tikə bədən sənin Hüseynindir. Onun üzvləri bir-birindən ayrılmış və sənin qızların əsir düşmüşlər. Allaha, Məhəmməd-Mustəfaya, Əliyyi-Murtəzayə, Fatimeyi-Zəhra və Həmzə-Seyyüdüş-şühədaya şikayət edirik. Ey Məhəmməd! Bu sənin Hüseynindir, çöldə düşüb. Külək onun bədəninə toz-torpaq səpir. O, zinazadələrin əli ilə öldürülmüşdür. Heyf və əfsus! (Elə bil) bu gün cəddim Rəsulullah vəfat etmişdir. Ey Peyğəmbər dostları! Bunlar .Mustəfa övladlarıdırlar ki, əsirlər kimi aparırlar

Ravi deyir: Hamısı öz əzizlərinin müsibətinə elə yanıqlı nalə edir və onlarla

.dərdləşirdilər ki, Allaha and olsun, dost-düşməni ağlatdılar

## İMAM SƏCCAD (Ə)-IN MÜDAFİƏSİ

İmam, yəni Allahın yer üzündə nümayəndə və canişini. Bütün mövcudatın həyatı və varlıq aləminin aramlığı İmamın vücudu səbəbindəndir. İmamət ailəsində böyümüş, Əli və Fatimə yetirməsi olan Zeynəb imamət məqamına bələddir, bu məqamın əzəmətini onun uca və dəyərli yerini yaxşı dərk edir, zəmanənin imamı qarşısında öz .vəzifələrini gözəl bilir. Bu sözə ən yaxşı şahid isə, tarixin özüdür

O, atası Əli (ə)-ın həyatı dövründə onun qızı olmasını nəzərə almaqdan, özünü atasının tapşırıqları qarşısında müti bilirdi. Qardaşı imam Müctəba (ə)-ın həyatı səh:٣٩

zamanında da bu qaydayda əməl edirdi. Qardaşı Hüseyndən itaəti isə, Kərbəla .tarixində aydın görünür. O Hüseyni öz canı kimi sevirdi

İndi imamət, qardaşının yadigarı imam Səccad (ə)-a çatmışdır. Hüseyn hərəminin qadın və uşaqlarının başçısı olan Zeynəb, heyrətamiz tədbir və müdriyyətlə bütün səhnələrdə hazırdır. Həzrət Səccad (ə) onun imamıdır. Zeynəb, o İmamın icazəsi olmadan bir iş görmür. İndi onun məsuliyyəti əvvəlkindən daha ağırdır. O, həm də İmamın canını qoruyur və onun üçün bundan mühüm bir iş yoxdur. Tarixə əsasən, Zeynəbi-Kubra ən azı üç yerdə imam Səccad (ə)-ın canını xilas etmək üçün çalışıb, .canfəşanlıq etmişdir

## MƏNİ DƏ ONUNLA ÖLDÜRÜN

Seyyidüş-şühədanın şəhadəti ilə qanlı Kərbəla hadisələrinin qiyam və şəhadətdən ibarət birinci mərhələsi sona çatır. İndi quru və qanlı Kərbəla çölündə, Peyğəmbər xanədanı və Hüseyn dostlarının doğranmış bədənləri, od vurulmuş xeymələr və bir də matəmə batmış qəlbi sınıq, Allaha ümidvar və imam Səccad (ə)-a baxan qadın və .uşaqlar var

İmam Hüseyn (ə)-ın qızı Fatimeyi-Suğranın dediyinə əsasən, aclıq, susuzluq və xəstəliyin ağırlığından imam Səccad (ə) otura da bilmir, biz ona o, da bizə ağlayırdı. Şimr piyada qüvvələrdən bir dəstə ilə gəlib, imam Səccad (ə)-ı öldürmək istədi. Bu vaxt şucaətli Əli qızı Zeynəb qalxıb buyurdu: Mən də onunla ölməsəm, o öldürülməyəcəkdir. .Şimr Zeynəbin canfəşanlığını nəzərə alaraq, fikrindən döndü

Zeynəbin bu şücaət və agahlıqla mövqe tutması, onun məktəbinin davamçıları üçün ən yaxşı dərs deyilmi? İnsan imamət və vilayət kimi dəyərlərin qorunmasında və öz vücudunun ən yaxşı dəyərlərindən də keçməməlidirmi? Allah yolunda fədakarlıq edənlər, əlillər, əziyyət çəkənlər həzrət Zeynəbi özlərinə nümunə götürməməlidirlərmi? Həqiqətən də imam Hüseynin Kərbəla və Aşurasından dərs almaq istəyən hər bir müsəlman kişi və qadının bu səhnələrə diqqət etməsi kifayət deyilmi? Zeynəb əbədiyyətinin səbəbi həmin güzəşt və fədakarlıqlardır. Biz – Zeynəb davamçıları da, Allah yolu olan imamət və vilayət yolunda hər növ əziyyət və .çətinlikliyə dözməyə hazır olaq ki, həmişə tarixdə başıuca və əbədi qalaq

## İMAM SƏCCAD (Ə)–A TİBBİ YARDIM

Məlum olduğu kimi, Seyyidüş-şühədanın şəhadətindən sonra Zeynəbi-Kubranın ən mühüm məsuliyyəti imam Səccad (ə)-ı qorumaq idi. Zeynəb özü ruhi təskinliyə ehtiyaclı bir vəziyyətdə olmasına və Əhli-beyt böyüyü hesab olunduğu üçün hərəmin qadın və uşaqlarının idarəsini üzərinə götürməsinə baxmayaraq, öz həssas vəzifəsini unutmur, onu gözəl surətdə yerinə yetirirdi. O, pərvanə kimi imamın nazənin .vücudunun dövrəsinə dolanır, xidmət edirdi

Şəhidlərin bədəni kənarında olan bu xidmətdən bir parçanı alim şəhid ustad :Mütəhhərinin bəlağətli bəyanından eşidək

Aşura əsrində (axşam üstü), Zeynəb təcəlli edir. Ondan sonralar, ona tapşırılmışdır.“ Karvan başçısı odur. Yeganə kişi, o vaxt ağır xəstə olub, xidmətçiyə ehtiyacı olan imam Səccad (ə)-dır. İbni Ziyadın ümumi əmrinə əsasən, Hüseyn övladlarının kişi cinsindən heç kəs sağ qalmamalıydı. Buna görə də, düşmənlər neçə dəfə imam Zeynəlabidini öldürmək üçün hücum etdilər. Lakin sonra özləri baxıb dedilər: Bu özü ölməkdədir. Və bu özü bir ilahi hikmət və məsləhət idi ki, həzrət imam Zeynəlabidin bu vasitəylə diri qalsın və imam Hüseyn ibni Əli (ə)-ın müqəddəs nəsli davam etsin. Zeynəbin işlərindən biri imam Zeynəlabidin (ə)-a qulluq idi. On birinci gün günortadan sonra, əsirləri gətirib ağac parçasından palanı olan miniklərə (dəvə, qatır ya hər ikisi) mindirdilər və onlara əziyyət vermək üçün göz qoyurdular ki, palanın üzərinə parça sərməsinlər. Sonra Əhli-beyt bir xahiş etdi və qəbul olundu. O xahiş bu idi: Dedilər; siz Allah, indi ki, bizi burdan aparırsız, Hüseynin qətligahından keçirin. çünki, istəyirik ki, əzizlərimizlə son dəfə vidalaşaq. Əsirlərin arasında, xəstə olduğu üçün, yalınz imam Zeynəlabidin mübarək ayaqlarını heyvanın qarnının altına bağlamışdılar, başqaları miniklərin üstündə sərbəst idilər. Qətligaha çatan kimi hamı biixtiyar özlərini yerə atdılar. Zeynəb özünü Əba Əbdillahın müqəddəs bədəninə çatdırır, onu o vaxtacan görmədiyi bir halda görür. Başsız və paltarsız bir bədən görür və bu bədənlə aşiqinə söhbətə girişir. Elə yanıqlı .nalə edir ki, düşmənin göz yaşı axır, dost və düşmən ağlayır

Hüseynin əza məclisini ilk dəfə olaraq Zeynəb qurdu. Amma eyni zamanda öz vəzifəsini də unutmurdu. Zeynəlabidinə baxmaq onun öhdəsindədir. Zeynəlabidinə baxdı, gördü ki, Həzrət bu vəziyyəti görməyindən elə narahatdır ki, elə bir indi canını tapşıracaq. Əba Əbdillahın bədənini qoyub, tez Zeynəlabidinin sorağına gəldi. Qardaş oğlu! niyə səni bir halda görürəm ki, ruhun bədənindən uçmaq istəyir. Bibican, öz əzizlərimin bədənlərini görə-görə necə narahat olmayım? Zeynəb o şəraitdə Zeynəlabidin (ə)-a təsəlli verməyə başlayır. İmamın qəlbi bütün xilqətin əzəmət və böyüklüyü qədərdir. Müsibətlər nə qədər böyük olsa da, İmam ruhunun böyüklüyü .qarşısında tabe və təslimdirlər

Məsum imamın hadisələrə Allah tərəfindən verilmiş elmi, heç bir qaranlıq nöqtə

qalmaması üçün ona bəsirət verir. Lakin bütün bunlarla yanaşı, məsum imamın şəhadəti, imamın özü qədər böyük və əzəmətlidir. Allah höccətinin bədəninin başsız, qüsl-kəfənsiz və tikə-tikə torpağa düşməsi bir müsibətdir ki, onun əzəmətini imam Səccaddan başqası dərk edə bilməz. çünki, imamın həqiqi məqamını imamdan başqası tanımaz. Bu tanıma və atası Hüseynin qətligahının acı mənzərəsinə bu baxış onu çox yorur. Eyni zamanda o, gərək Zeynəbin cavabını da versin. Burdadır ki, buyurur: necə tabsızlıq etməyim, bir halda ki, atam Hüseyn, qardaşlarım, əmilərim və əmim oğlanlarımın qana bələnib, yerə düşdüklərini görürəm. nə bir kəs onları kəfənləyib və .nə torpağa tapşırıb. Elə bil bunlar müsəlman deyillər

## ZEYNƏBİN İMAMI SAKİTLƏŞDİRƏN SÖZLƏRİ

Ümmü-Əymən çox möhtərəm bir qadındır. Zahirən Xədicəyə kənizlik eləmiş, sonralar isə, azad buraxılaraq Peyğəmbərin evində o həzrətin hörmət etdiyi şəxslərdən olmuşdur. O, bir kəsdir ki, Peyğəmbərdən hədis rəvayət edir. Bu qadın uzun illər .Peyğəmbərin evində idi. Peyğəmbərdən Zeynəbə bir rəvayət etmişdi

Bu rəvayət ailəlik, yəni bu ailənin gələcəkdəki talehinə aid olduğu üçün, Zeynəb onun doğruluğuna əmin olmaqdan ötrü Əli (ə)-ın ömrünün sonlarında atasının yanına gəldi: “Ey ata, mən Ümmi-Əyməndən bu cür bir hədis eşitmişəm, istəyirəm bir dəfə də sizdən eşidəm, görüm elədir, ya yox? Hamısını danışdı. Atası təsdiq edib buyurdu: “Ümmü Əymən düz deyib, elədir. Zeynəb o şəraitdə bu hədisi imam Zeynəlabidin üçün nəql edir. Bu hədis də gəlmişdir ki, bu hadisənin bir fəlsəfəsi vardır. Olmaya, bu şəraitdə xəyal edəsiz ki, Hüseyn öldürülüb, aradan getdi. Qardaşoğlu! Babamızdan belə rəvayət olunmuşdur ki, Hüseyn (ə) indi onun cəsədini gördüyün yerdə kəfənsiz .dəfn olunacaq və bura – Hüseynin qəbri təvaf yeri olacaqdır

Kələcəkdə buranın pak müxlis insanların Kəbəsi olacağını Zeynəb imam Zeynəlabidin .(ə) üçün rəvayət edir

Zeynəbi-Kubranın babasından sonra ona çatmış xəbər gerçəkləşdi. Seyyidüş-şühədanın pak məqbərəsi tarix boyu Allah eşqi və Allah yolunda cihadın cilvələndiyi məkana çevrildi. Möminlər, azad insanlar və ədalət aşiqləri Hüseynin kəbəsinin .dövrəsini təvaf etməklə düzgün yaşayış üsulunu o Həzrətdən ilham alırlar

# DÖRDÜNCÜ FƏSİL

## TƏBLİĞAT KARVANINDA

Təbliğat karvanında

Kufəyə doğru

Kufə və kufəlilər

Minbər üzərində

İbni Ziyadın sarayında

Zeynəb məktəbindən dərslər

İmamın əzəməti

Gözəl baxış

İmamı xilas etmək

Şama doğru

Yezidin qarşısında

Əbədiyyat danışığı

səh:۴۲

Qorxmazlıq zirvəsində

Zeynəbin sözlərinə bir neçə işarə

Qar qovluq və murdarlığın kökləri

Allah və şeytan dəstələri

Hicab və iffətin qiyməti

Düzgün fikir

Zeynəb-Kubra və başqa bir vəzifə

Bundan sonra Kərbəla tarixi və Zeynəbin davranışında təzə bir səhifə açılır. İndi Zeynəb, rəhbəri Seyyidüş-şühəda (ə) və himayəçiləri Əbbas, Əliəkbər, Bəni Haşimin və imam Hüseyn (ə)-ın vəfalı səhabələri olan karvana başçıdır. Həmin kişilər ki, karvandakı uşaqların, xanımların ümidi və sığınacaqları idilər, onların vücudu Əhli-beytə təsəli idi. Bu himayələr sayəsində Seyyidüş-şühəda (ə)-ın həyatının son anlarına qədər düşmən xeymələrə yaxınlaşmağa və Əhli-beytə bir şey etəməyə cürət etmirdi. Əba Əbdillahın döyüş anındakı «La hovlə vəla qüvvətə illa və billah» fəryadları .onların ürəyinə sakitlik bəxş edir və onlara təsəlli verirdi

İndi, əzizlərinin ən yaxşısı şəhid olduqdan, qarət olunduqdan, xeymələrə od vurulduqdan, düşmənin amansız cəlladlığından çəkilən əzab-əziyyət, iztirab və pərişanlıqlara dözdükdən sonra və şəhidlərin qana boyanmış parça-parça olmuş cəsədlərinə tamaşa etdikdən sonra, bu qəlbi dağlılar bəşər tarixi boyunca uzanan bir hərəkət və əbədiyyət ucalığı qədər fəryad karvanına bənzəyirdi. Bunlar ən böyük, ən ilahi bir qiyamın müjdəçiləridirlər. Onun dəyəri Allahın ən yaxşı məxluq və vəfalı dostlarının qanı ilə verilibdir. Bu karvanın rəhbəri imam Səccad (ə)-dan sonra, Peyğəmbərin xanədanından olan böyük bir qadındır ki, dağlar onun möhkəmliyi qarşısında heyrətə gəlir. O, Əlinin rəşid qızı və Fatimənin elmli övladıdır ki, Bəni Üməyyənin zülm və cinayət saraylarını bir-birinə vurub alt-üst edir. O, Zeynəbdir ki, öz imamının fərmanı ilə Fatimənin əzizlərindən ibarət karvana böyüklük edir və ən böyük müsibətlərə dözdükdən sonra, imam Hüseyn (ə) və onun fədakar dostlarının qanlı

.xəbərini insanların qulağına yetirir

İndi bu karvan, əziyyət çəkmiş, öz əzizlərini əldən vermiş qadın və uşaqlarla, Zeynəbin .rəhbərliyi ilə öz əzəmətli və tarixi hərəkatını başlayır

**KUFƏYƏ DOĞRU**

Hicrətin ۶۱-ci ili, Məhərrəm ayının on birinci günü, Əhli-beyt əsirləri karvanını Kərbəladan Kufəyə yolladılar. Əhli-beyt əsirləri karvanını Kərbəladan Kufəyə yolladılar. Əhli-beyt barəsində qərara gəlmək imam Səccad (ə)-ın öhdəsinə idi. çünki, o, imamdır və ona itaət etmək hamıya vacibdir. Karvanın icraçı rəhbəri Zeynəbi-.Kubradır. O, imam Səccada ən yaxın adam və Aşura qadınlarının ən böyüyüdür

Aydındır ki, Aşura günü hər cür çətinlik, dərd-bəlaya dözmüş və çox ürək ağrıdan səhnələri gözləri ilə görmüş, əizlərinin qəm yükünü öz ürəyinə almışdı. İndi isə

çılpaq miniklərlə düşmənin amansız mühasirəsində, kafir əsirləri kimi aparılan .cəmiyyəti idarə etmək asan bir iş deyildi

Bəli, qadınların, uşaqların istək və arzularına, hisslərinə cavab vermək, eyni halda imam Səccad (ə)-ın canını qorumaq Zeynəbin karvanda olan ən böyük məsuliyyəti olub onun risalət yükünü ağırlaşdırırdı. Amma Zeynəbin böyük ruhu, çətinliklərin amansız dalğaları və müsibətlərin qorxunc tufanı qarşısında geriyə oturacaq qədər müqavimətsiz deyildi. O, çiynində olan yükün öhdəsindən yaxşı gəldi və böyük karvanı .tədbir, mehribanlıq və amansız mücahidliklə idarə edib mənzil başına yetirdi

## KUFƏ VƏ KUFƏLİLƏR

Əhli-beyt əzizlərinin başıuca və iftixarlı karvanı Kufəyə yetişdi. Karvanın yolu, tamaşaya gələn çamaatla dolu idi. Kufə, Əmirəl-möminin və imam Müctəba (ə)-ın xilafəti dövrünün mərkəzi, şiə cəmiyyətinin mühüm məntəqələrindən olduğu üçün .tamamilə İbni Ziyadın qoşunlarının mühasirəsində idi

Kufə camaatı vəfasızlıqla məhşur idi. Bu ruhiyyə Əmirəl-möminin və imam Mücətbanın dövründə, Allah Rəsulunun övladlarının qarşısında sıraya düzülüb, Kərbəla faciəsini .törətməklərində, yaxşıca sınaqdan keçdi

Kufə camaatı həmin camaatdır ki, Fərəzdəq, imam Hüseyn (ə)-ın Kufə camaatının vəziyyəti barədə verdiyi suala belə cavab verdi: "Kufə camaatının ürəkləri sizinlə, .qılıncları isə sizin əleyhinizədir

Bəzi tədqiqatçıların dediyinə görə, Kufə camaatı tez sakitləşərdilər. Bir söz eşitcək .qəzəblənər və bir hadisə görçək yumşalırdılar

Onlar Hüseyn ibni Əlinin nümayəndəsini elə həvəslə qarşıladılar və belə namərdliklə də onu İbni Ziyadın əlinə verdilər. Elə qeyrətsizcəsinə evlərinin qapısını bağlayıb sakit oturdular ki, İbni Səd və onun qoşunları imam Hüseyn (ə) və onun dostlarını .öldürdülər. İndi də onun qadın və uşaqlarını şəhərlərə əsir aparırlar

Bəli, Kufə camaatı o vaxt ayılıb öz işlərinin çirkinliklərini görürlər ki, Hüseyn (ə)-ın qadın və qızlarını, Əli övladlarını və Peyğəmbər nəvələrini kafir əsir kimi bu şəhərə gətirdilər.

Peyğəmbərin xəlifəsi və müsəlmanların əmiri olan Əli (ə)-ın bu şəhərdə beş illik hakimiyyətindən iyirmi ildən çox keçməzdi. Yaşı otuzu keçməyən qadınlar həzrət Zeynəbi belə günlərdə görmüş və Əli (ə)-ın gözündə isə onun həya əzəmətini müşahidə etmişdilər. Bu mənzərəni görmək keçmiş xatirələri diriltdi. Küçələr, məhəllələr, tinlər, bazar şivənlə doldu. Qadınların şivəni uşaqları ağlatdı və uşaqların ağlamağı qocaların bərk ürəyini yumşaltdı. Bir dəfəyə hər tərəfdən fəryad və fəqan qalxdı. Bu cəmiyyətin içində öz sözləri ilə həyacanı zirvələrə yetirə biləcək şəxs Əlinin .qızı Zeynəb idi

səh:۴۴

İmam Zeynəlabidin (ə) o günlərdə bərk xəstələndiyindən taqətsiz idi. Camaatın şivən qoparıb ağladığını gördükdə yavaşca belə buyurdu: Bunlar bizə ağlayırlar?! Bəs bizi ?kim öldürdü

Bu vaxt Zeynəb (s) əli ilə işarə edib hamını sakitləşdirdi. Bütün səslər kəsildi. Dəvələrin .zınqırovları işdən düşdü. Belə ki, yalnız nəfəslər eşidilirdi

Zeynəb (s) xütbə oxuyub kufəlilərin yatmış vicdanını oyatdı. Kufəlilər hələ indi gözlərini açıb, Əhli-beytin haqqında çox böyük cinayət işlətdiklərini və heç bir yolla aradan .getməyəcək böyük bir rüsvayçılıq törətdiklərini gördülər

.Zeynəb (s) elə bəlağətlə danışırdı ki, elə bil Əli (ə) nitq söyləyirdi

Ravi belə deyir: Mən heç vaxt belə şücaət və əzəmətlə danışan iffətli və həyalı qadın .görməmişdim

.Ustad Şəhid Mütəhhəri demişkən: Əli şücaəti, qadınlıq həyası ilə qarışmışdı

Zeynəb (s) iffət və həya ilə öz sözlərini Allaha həmd və səna etdikdən, Peyğəmbərə, :onun pak, seçilmiş xanədanına salamdan sonra belə buyurdu

Ey Kufə camaatı! Ey hiyləgər və xəyanətkar camaat! Heç bir zaman gözlərinizin yaşı qurumasın. Siz o qadına bənzəyirsiniz ki, öz əyirdiyi ipləri bir dəfəyə zay edir. nə sizin peymanınızın dəyəri var, nə də sizin andınızın etibarı. Faydasız sözdən, özünə pərəstişdən və üzdə yaltaq kənizlər kimi yaltaqlanıb, arxada düşmənlə saziş etməkdən başqa nə varınızdır. Siz peyinlikdə bitən yaşıl və təzə bitkiyə oxşayırsınız. Siz bəzənmiş qəbrin divarlarının suvağına oxşayırsınız. O dünya üçün pis azuqə hazırlamısınız! Allah qəzəbi, Cəhənnəm əzabı! Ağlayırsınız? Bəli, ağlayın, and olsun Allaha ki, ağlamağa layiqsiniz. çox ağlayın və az gülün. Qazandığınız çirkinliklərə niyə ağlamayasınız? Heç bir su ilə yuyulmayan çirkinlik! Peyğəmbər balasını və behişt cavanlarının ağasını öldürməkdən pis nə çirkinlik ola bilər?! Sizin yolunuzun çırağı və qara gününüzün dostu olan bir insanı! ölün və xəcalətli başınızı aşağı salın. Bir anda öz .keçmişinizi bərbad etdiniz və gələcəyiniz üçün heç bir şey əldə etmədiniz

Bundan sonra siz gərək xar və məğlub yaşayasınız, çünki siz özünüzə Allah qəzəbi qazandınız. Elə bir iş gördünüz ki, az qalıb göy yerə düşə və yer parçalana, dağlar bir-birinə dəyə. Bilirsiniz ki, necə bir qan axıdıbsız? Bilirsiz, hicabsız halda küçə və bazarlara gətirilmiş qadın və qızlar kimlərdir? Bilirsiz ki, Peyğəmbər ciyərini parçalamısınız? nə qədər çirkin və ağılsız iş görmüsünüz. Elə bir iş ki, onun çirkinliyi dünyanı başdan-başa doldurub. Göydən qan damlalarının yağmasına təəccüb edirsiniz?! Amma bilin ki, axirətin əzab və xarlığı çətin olacaq. Əgər etdiyiniz işə Allahın qəzəbi tutmursa rahatlanmayın. Allah günahın cavabını dərhal vermir, amma .məzlumların qanını da yerdə qoymur. Allah hər şeyin hesabını edir

Zeynəbin dağlı qəlbindən və imanlı ürəyindən gələn təkanverici və bəlağətli sözlər Kufə camaatına od vurdu. Ravi belə nəql edir: And olsun Allaha, o gün camaatı çox heyran və pərişan gördüm. narahatlıqdan əllərini ağızlarına qoyub səh:۴۵

təəssüf edir və ağlayırdılar. öz yanımda bir kişini gördüm ki, ağlamaqdan üzünün tükləri göz yaşı ilə islanmışdı və Əhli-beytə xitab edərək belə deyirdi: Anam-atam sizə qurban olsun, sizin yaşlılarınız yaşlıların ən yaxşısıdır, cavanlarınız, cavanların ən yaxşısıdır, qadınlarınız, qadınların ən yaxşısıdır və nəsliniz, nəsillərin ən yaxşısıdır. .Onlar hamıdan üstün və ucadırlar

Zeynəbin sözü qurtarmağa az qalmış imam Səccad (ə) buyurdu: Bibican! Sakit ol, gərək qalanlar keçmişlərindən ibrət alsınlar. Həmd olsun Allaha ki, sən təlim görməmiş .alim və öyrədilməmiş müdriksən. Ağlamaq və nalə çəkmək gedənləri qaytarmaz

İmamın bu sözləri Zeynəbin vəhy çeşməsindən içmiş və bəşər elmindən yuxarı səviyyəli bir elmdən bəhrələnmiş əzəmət və cəlalını aşkar edirdi. O, vilayət .məktəbində dərs oxumuş və ürəyi elm, mərifət nuru ilə işıqlanmışdı

Zeynəbin, Əli sözlərinə oxşar sözlərində bəzi məqamlar var ki, onun bilikli və ziyalı :olmasına sübutdur. Onlardan bəzisinə toxunuruq

Onun əhatəli kəlamı və bəyanının bədiiliyi o qədər idi ki, bəziləri danışanın Əli (ə).۱ .olduğunu zənn etdilər

Kufə camaatını tanıtdırması, onların şəxsiyyətlərini bəyan etməsi, cəmiyyət, ruhiyyə.۲ və geriyə oturmalarının amillərinə olan dərin elmini göstərir. Bu fərasət cəmiyyət və camaatı tanımaqda atasından yetişən mirasdır. Ərəb ədiblərindən biri olan Cahizin dediyi kimi ki, Əli (ə) hər bir tayfanın ruhiyyə və xislətini yaxşı tanıyır və onlara uyğun .danışırdı

Zeynəb (s) elə danışdı ki, hamıda dəyişiklik yaratdı və onlar öz əməllərindən peşiman .oldular

Düşmənin Kərbəlada Peyğəmbər xanədanına rəva qıldığı cinayətlərin əsərini bəyan.۳ etməsi və həmçinin o cinayətin böyüklüyünü izah etməsi camaatı bu cinayətin dərinlikləri ilə daha çox agah edib onların ayılmasına səbəb oldu və onları düşmənlə mübarizəyə qaldırdı. Elə qiyamlar baş verdi ki, Bəni Üməyyə səltənətini alt-üst edib, .Kərbəla canilərindən qanlı qisas aldı

.Bu həzrət Zeynəbin aşura təbliğatının bir nümunəsi idi

Bəzi tarix kitablarında belə nəql olunub ki, Zeynəbdən sonra kiçik Fatimə və Ümmü Gülsüm də xütbə oxuyaraq, Kufə camaatını məzəmmət edib danladılar və həmçinin .bəzi başqa kitablarda həzrət Səccad (ə)-dan da xütbə nəql olunub

## İBNİ ZİYADIN SARAYINDA

Qürur badəsi ilə məst olan İbni Ziyad özünü həmişəkindən qüdrətli görürdü. öz qüdrətini göstərib Kufə camaatını qorxutmaq üçün onların hamısına öz sarayında keçirdiyi məclisdə iştirak etməyə icazə verdi. O, hər şeyin tamamlandığını güman edib Yezidin qoşununun qələbəsini bu məclisin keçirilməsi ilə bayram etmək istəyirdi. Ona görə də Seyyidüş-şühəda (ə)-ın mübarək başının gətirilməsinə fərman

verdi. İmamın başını onun qarşısına qoydular. İbni Ziyad gülür və əsası ilə o Həzrətin .dişlərinə vururdu. O, öz xam xəyalı ilə böyük qələbə əldə etmişdi

Əsirlərin karvanını İbni Ziyadın məclisinə gətirdilər. Zeynəb (s) köhnə paltarda tanınmaz şəkildə bir guşəyə çəkildi və orada əyləşdi. Əhli-beytin başqa qadınları da .onun ətrafına yığışdılar

İbni Ziyad dedi: O qadın kim idi ki, öz kənizləri ilə kənarda oturdu? Zeynəb (s) cavab vermədi. İbni Ziyad ikinci və üçüncü dəfə də həmin sualı təkrar etdi. Qadınlardan biri dedi: Bu Peyğəmbər balası Fatimənin qızı Zeynəbdir. İbni Ziyad üzünü Zeynəbə tutub dedi: "Şükr olsun o Allaha ki, sizi rüsvay etdi, öldürdü və göstərdi ki, sizin dedikləriniz ".yalandan başqa bir şey deyildir

Zülmdən başqa dayağı olmayan bir zülümkar üçün, onun qüdrətini saymamazlıqla" .məsxərə etməkdən dərdli danışıqları üçün məzəmmət olunmazlar

:İbni Ziyad özünü Zeynəbin sözünün qarşısında aciz görüb dedi

Sənin qohumlarının və nəslinin böyük itaətsizliyi ürəyimdə bir dərd idi. Allah o dərdə şəfa verdi. Bu sözlə Zeynəbin qəlbi sındı və ağlayaraq dedi: Mənim sərvərimi öldürdün, xanədanımı məhv etdin, bizim kök və budağımızı vurdun: Əgər sənin şəfan .bundadırsa, şəfa tapdın

İbni Ziyad dedi: Bu qadın gözəl danışır. Atası da mahir idi, gözəl üslub və ahənglə .danışırdı

Zeynəb (s) buyurdu: Qadınların ahənglələ nə işləri? İndi mənim şer söyləmək .vaxtımdırmı? Ürək yanğısından başqa dilimə bir şey gəlmir

Bununla Əlinin şücaətli qızı Zeynəb (s) ürəyində qorxuya yol vermədi, təsirli və kəsərli sözləri ilə, İbni Ziyadı öz qüdrətini göstərmək üçün məclisə yığdığı camaatın gözləri qarşısında rüsvay etdi, Peyğəmbər xanədanına rəva qıldığı cinayətlərini ifşa etdi. Əli qızı dilləndi. Dilləndi amma elə bil indiyəcən heç nə baş verməmişdir. nə onun bir adamını öldürüblər, nə də özünü əsir tutublar. Elə bil, cavabını vermək istədiyi bu kişi .ən adi bir işarə ilə onu və bütün yoldaşlarını öldürə bilməzdi

Şükr olsun o Allaha ki, öz peyğəmbəri Məhəmməd (s) ilə bizə kəramət buyurub, - çirkinliklərdən pak etdi. Yalnız günahkar rüsvay olar və günahkar yalan danışar. Şükr .olsun o Allaha ki, o biz deyilik, başqasıdır

?İbni Ziyad dedi: Allahın Əhli-beytlə davranışını necə gördün

Zeynəb cavab verdi: Onlar bir dəstə idilər ki, Allah, şəhadəti onlara müqəddər etmişdi. Onlar öz qəbrlərinə tərəf tələsdilər və mən burada gözəllikdən başqa bir şey görmədim. Allah səninlə onları bir araya gətirəcək və sən onlarla üzləşəcəksən. İndi .gör qalib və xoşbəxt kimdir. Ey Mərcanənin oğlu! Anan matəmində otursun

Ravi deyir: Bu sözlərdən sınan İbni Ziyad elə atıldı ki, guya Zeynəbi öldürəcəkdi. İbni .Ziyadın ətrafındakılardan biri dilləndi: Ey Əmir! Bu qadındır

## ZEYNƏB MƏKTƏBİNDƏN DƏRSLƏR

### İMANIN ƏZƏMƏTİ

Zeynəb (s) İbni Ziyadla rəftarında göstərdi ki, mömin insan, əsir olmasına baxmayaraq heç vaxt güclü və qüdrətli düşmənin qarşısında başını zillətlə aşağı salmayacaq.

Zeynəbin İbni Ziyadın qüdrəti qarşısında yenilməzliyi, əzəməti və iftixarı, onun Allaha olan imanından və xatircəmliyindən qaynaqlanırdı. O, imam Hüseyn (ə) kimi xatircəm bir nəfsə malik idi. Bütün bu xatircəmlik və qorxmazlığı qəlbində ilahi təfəkkürü diri saxlamaqla əldə etmişdi. Allahı düşünüb Onu yad edən insan heç vaxt sərgərdan qalmaz və məğlub olmaz. necə ki, imam Hüseyn (ə) heç bir tərəddüd etmədən Yezidlə beyət zillətini qəbul etmədi, qəlbləri ələ alıb qələbə çaldı, möminlərin, Allah dostlarının ürəklərinə malik oldu və Aşura, imanlı qəlblər üçün ən böyük cazibə oldu. İmam Hüseyn (ə) yolunu davam etdirən və onun məktəbinin şagirdi olan Zeynəb (s), öz sözləri ilə qanlı Kərbəla hərəkatının izzət və əzəmətini artırdı.

### GÖZƏL BAXIŞ

Zeynəbdən öyrəniləsi dərslərdən biri, Allah yolunun çətinlik və müsibətlərini gözəl görməsi, onun belə çətinliklərə ilahi baxışıdır.

necə ki, gördük, Zeynəb (s) İbni Ziyadın, "Allahın Əhli-beytinlə rəftarını necə gördün" sualının cavabında buyurdu:

«Ma rəəytu illa cəmila».

Allah yolunda gördüyüm çətinliklər, müsibət və müşküllər, hamısı mənim üçün gözəl idi.

Doğrusu! Əliəkbərin, Qasimin, Əbbasın, südəmər uşağın şəhadəti və Seyyidüş-şühəda (ə)-ın şəhadəti gözəl idimi?! Xeymələrin yandırılması və qarət olunması, uşaqların pərişan və sərgərdan olmaları və Allah Rəsulunun övladlarına üz verən müsibətlər gözəl idimi?! Peyğəmbər Əhli-beytinin əsir olub küçə və bazarlarda naməhrəmlərin gözü qarşısında gəzdirilməsi gözəldirmi?!

?Bu gözəl baxış necə təfsir olub açıqlanacaq

Həzrət Zeynəb (s) özünü haqqın bəndəsi hesab edib ilahi vəzifəni yerinə yetirməyi özünə şərəf bilir. Vəzifəyə əməl yolunda imam Hüseyn (ə) kimi kamil insanın və onun səhabələri kimi fədakar dostların şəhadəti, Əhli-beytin əsarəti, əziyyəti və müsibətləri hamısı xoşdur, şirin və gözəldir. Bu mömin insanların dünya görüşüdür ki, Allah tərəfindən onlara nə çatsa, hamısını xeyirli və gözəl görərlər. çünki, Allah, öz bəndələri üçün xeyirdən başqa bir şey istəmir. Bu varlıq aləminin bütün mövcudlarına ilahi və .gözəl baxışdır

,Mən bütün şəhərdə öz eşqimlə məşhuram

.Mən gözümü pis görməyə aludə etməmişəm

.Vəfa yolunda əziyyət çəksək də şadıq

.çünki, bizim təriqətdə incimək kafirlikdir

Bəli, belə bir dünya görüşü və belə bir inam zillət və acizliyə yönəlməyərək düşməni dizi üstə çökdürər Allahın, Onun Rəsulunun və mələklərin salam və rəhməti olsun Zeynəbi-Kubraya ki, bizə Allah yolunun çətinliklərni necə görmək dərsini öyrətdi, səbr .və dözüm dərsində müəllimimiz oldu

### İMAMI XİLAS ETMƏK

İbni Ziyad Zeynəbin şücaətli və təsirli cavablarına mat qaldıqdan sonra imam Səccad .(ə)-a baxıb dedi: Kimsən? İmam buyurdu: Əli ibni Hüseyn

.Bəs Allah Əli ibni Hüseyni öldürmədi? – İmam sakit qaldı

?niyə danışmırsan

.Əli deyilən bir qardaşım var idi, camaat onu öldürdü

.Yox, onu Allah öldürdü

:İmam cavabında bu ayəni oxudu

.«Əllahu yətəvəffəl ənfusə hiynə movtiha»

.«Allah canları ölüm vaxtı bütünlüklə alır»

İbni Ziyad əsəbləşdi və dedi: Hələ də mənimlə belə danışmağa cürətin var? Onu aparın .və boynunu vurun

Bu vaxt Zeynəb imamdan yapışıb buyurdu: Ey Ziyadın oğlu! Bu qədər qanımızı tökdün bəsdir. O, İmamı qucaqlayıb dedi: Ondan ayrılmaram. Əgər onu öldürsən məni də .onunla öldür

İbni Ziyad bir neçə an onların ikisinə baxıb dedi: «Əcəbən lirrəhmi!» “Qohumluq qəribə şeydir!” Allaha and olsun, bu qadın istəyir öz qardaşı oğlu ilə öldürülsün. Onu buraxın. Zənnimcə bu xəstəlik onu ayaqdan salar. Bu yolla Zeynəb başqa bir dəfə öz himayə və canfəşanlığı ilə imamını qoruyub, onu İbni Ziyadın cəlladlarının əlindən xilas etdi, .bununla da İmamət və Vilayəti qorumaq dərsini hamıya öyrətdi

### ŞAMA DOĞRU

Əsirlər karvanı İbni Ziyadın zindanında çətin günlər keçirdikdən sonra Şama .göndərildi

Şam müsəlmanların əlinə keçən gündən Xalid ibni Vəlid və Müaviyə ibni Əbu Süfyan“ kimi hakimlər görmüşdü. Bu diyarın camaatı nə Peyğəmbərin söhbətlərini eşitmişdilər, nə də onun səhabələrinin iş üsulunu bilirdilər. Peyğəmbərin səhabələrindən bu diyara köçüb burada yaşayanlar da pərakəndə olduqlarından

nüfuzları yox idi. nəticədə, Şam camaatı Müaviyənin və onun ətrafındakılarının .”rəftarını müsəlmanlıq qaydaları bilirdilər

Belə bir şəhərin camaatı əsir karvanının gəlişi vaxtı bayram və şadlığa qərq olmuşdular. Yezid öz sarayında bir məclis təşkil etmişdi. Hazırlanmış adamlar məclisin .ətrafında oturmuşdular ki, öz gümanları ilə Yezidin böyük qələbəsini bayram etsinlər

### YEZİDİN QARŞISINDA

Seyyidüş-şühəda (ə)-ın başını Yezidin qarşısına qoydular. Bu vaxt Əhli-beyt əsirlərini məclisə daxil etdilər. Seyyidüş-şühəda (ə)-ın qızının gözləri Şamın kəsilmiş başına .düşdü. O, ucadan elə nalə etdi ki, bütün məclisə vəlvələ düşdü

Amma Zeynəb qardaşının başını gördükdə həzin və dərdli bir səslə ürəkləri :qəmləndirdi, nohə oxumağa başladı

Ya Huseyna, ya Həbibəllah, yəbnə Məkkətə və mina, yəbnə Fatimətəz-zəhra » .«səyyidəti nisai, yəbnə bintəl Müstəfa

Ey Hüseyn! Ey Allahın istəklisi! Ey Məkkə və Mina övladı, ey bütün qadınların sərvəri“ .olan Fatimeyi Zəhranın oğlu! Ey Peyğəmbər qızının oğlu

Ravi deyir: Allaha and olsun, məclisdəkilərin hamısını ağlatdı. öz mənsəbpərəstliyi ilə məst və məğrur olan şərabxor Yezid sakit oturub əlindəki əsa ilə imamın müqəddəs dişinə vurur və deyirdi: Kaş mənim Bədr döyüşündə iştirak edən və Xəzrəc qəbiləsinin, oxların vurduğu ziyandan əziyyət çəkdiyinin şahidi olan böyüklərim bu gün məclisdə şadlıqlarından qışqırıb deyəydilər: Yorulmayasan, ey Yezid! Onların böyüklərini, rəhbərlərini öldürdük və Bədr gününün əvəzini çıxdıq. Haşim qəbiləsi səltənətlə oynadılar. nə göydən bir xəbər gəlib, nə də vəhy nazil olub. Əhmədin acığını .balalarından çıxmasam, Xəndəf qəbiləsindən deyiləm

Bu evlərdə Peyğəmbərdən, din və Qurandan heç bir xəbər yoxdur. Gördüklərimiz“ .cahillik dövrünün qisas xatirələrinin təzələnməsidir. Qanı qanla yuduq

### ƏBƏDİYYƏT DANIŞIĞI

Əgər məclis həmin yerdə sona yetsəydi Yezid qalib gələr, ya da onun əmri ilə edilən işlər o qədər də çirkin görünməzdi. Amma Zeynəb işin bu şəkildə sona çatmasına imkan vermədi. Yezidin şadlıq saydıqlarını onun ağzında zəhərdən də acı etdi. Məclisdəkilərə göstərdi ki, qarşılarında dayananlar o adamın qızlarıdır ki, Yezid onun adı ilə Şam camaatına xəlifəlik edir. Onlara anlatdı ki, islam hökumət olmamışdan qabaq dindir. Hakimdən üzü aşağı ən kiçik vəzifəli adama qədər, Allah qarşısında etdiyi iş və danışdığı söz üçün məsuliyyət daşıyır. Onlara göstərdi ki, islam təqva sütunu .üstündə möhkəmlənir, nəinki qüdrət

Zeynəb anası Fatimə (s) kimi zülmkarların qarşısında, qamətini düzəltdi, ayaq üstə və hamının görüb eşidəcəyi şəkildə Allaha həmd və səna etdi, Peyğəmbər və onun Əhli-.beytinə salam göndərdi və öz sözünü Qurandan bir ayə ilə belə başladı

.«Sümmə kanə aqibətəlləzinə əsaussuvə ən kəzzəbu bi ayatillah»

Pis iş tutanların işinin axırı bu idi ki, Allahın ayələrini yalan bilib və onu istehza etdilər."" Ey Yezid! Elə fikirləşirsən ki, göyü, yeri bizə dar edib, əsirlər kimi bu şəhərdən o şəhərə aparmaqla biz xar olduq, sən isə izzətli? Qiymətinin artdığını güman edərək belə qürrələnib təkəbbür edirsən? Padşahlığına maneə olmadığını və işlərinin yaxşı getdiyini gördükdə özünə sığmırsan. Lakin bunun sənə özünü olduğun kimi tanıtmaq üçün verilən bir fürsət olduğunu bilmirsən. Allahın buyruğunu unutmusan ki, buyurur: "Kafirlər onlara verdiyimiz fürsətin özləri üçün yaxşı olduğunu güman edirlər. Biz onlara möhlət veririk ki, günah yükünü ağırlaşdırsınlar. Sonra elə bir əzaba düçar olarlar ki, xar və rüsvaylıqdır. Ey azad olunmuşun oğlu!* Bu ədalətmidir ki, sənin qızların və kənizlərin pərdə arxasında izzətlə oturalar, amma sən Peyğəmbərin qızlarını əsir edərək, onların hörmət pərdəsini yırtıb səslərini boğazlarında qoyasan və yad kişilər onları dəvə üstündə bu şəhərdən o şəhərə gəzdirələr! Belə ki, nə onlara sığınacaq verən ola, nə qoruyan ola, nə də bir böyükləri ola. Camaat axışıb hər tərəfdən onlara tamaşaya gələlər. Amma ürəyi bizim ədavətimizlə dolu olan adamdan bundan başqa bir şey ummaq olarmı? Deyirsən kaş Bədr döyüşündə öldürülən babaların burada olaydılar və bu sözü deyəndə ağacla Peyğəmbər balasının dişlərinə vurursan? Heç vaxt dərk etməzsən ki, çox çirkin bir iş tutmusan. niyə də etməyəsən? Sən yerin ulduzları olan Peyğəmbər balalarının və Əbdül Mütəllib ailəsinin qanını tökməklə iki xanədanın düşmənliyini təzələdin. Şadlanma, çünki, tezliklə Allah dərgahına gətiriləcəksən. O vaxt arzu edəcəksən ki, kaş kor olaydım və bu günü görməyəydim, "Babalarım bu məclisdə olsaydılar, şadlıqlarından özlərinə sığmazdılar" sözlərini deməyəydim. İlahi özün bizim haqqımızı al və bizim heyfimizi bizə zülm edənlərdən çıx. And olsun Allaha, öz dərini və öz ətini qopartdın. Həmin gün Allah Rəsulu, onun xanədanı və ürək parçaları Allahın rəhməti sayəsində rahatlanacaqlar, amma sən çox rüsvay halda Onun qarşısında dayanacaqsan. O gün həmin gündür ki, Allah öz vədəsini yerinə yetirəcək. Hərəsi bir küncdə öz qanına bulaşmış bu məzlumlar

bir yerə yığılacaqlar. çünki, o özü belə deyir: «Allah yolunda ölmüşləri ölü sanmayın, onlar diridirlər və Allahın nemətlərindən bəhrələnirlər». Amma səni nahaq yerə müsəlmanların boynuna mindirən Müaviyə, Məhəmməd məhkəməsi qurulacağı, Allahın hakimlik edəcəyi və sənin əl-ayağının o məhkəmədə şəhadət verəcəyi zaman .hansınızın daha bədbəxt və sığınacaqsız olduğunuzu biləcəksən

Ey Allahın düşməni Yezid! And olsun Allaha, mənim gözümdə o qədər qiymətin yoxdur ki, səni danlayam, ya təhqir edəm. Amma nə edim, yaş gözlərimdə həlqə vurur və ah sinəmdə şöllənir. Hüseyn öldürüldükdən sonra Şeytan qoşununun Peyğəmbər xanədanının ehtiramını sındırmaqla məzlum və zəhmətkeş müsəlmanların zəhmətinin nəticəsi olan beytul-maldan ənam almaq üçün, bizi Kufədən ağılsızların sarayına gətirdikdən sonra, bu cəlladların əli bizim qanımıza

bataraq ağızları bizim ətimizin parçaları ilə dolduqdan sonra, yırtıcı canavarlar o pakizə cəsədlərin həndəvərinə dolaşdıqdan sonra səni danlayıb, məzəmmət etmək nəyə yarar? Əgər bizi öldürüb, əsir etməklə faydalandığını zənn edirsənsə, tezliklə bunun ziyandan başqa bir şey olmadığını görəcəksən. O gün etdiklərindən başqa bir nəticəyə yetişməyəcəksən. O gün sən İbni Ziyadı köməyə çağıracaqsan, o, da səndən kömək istəyəcək. Sən və itaətçilərin Allahın ədalət tərəzisi ətrafında toplanacaqsınız. O vaxt Peyğəmbər balalarını öldürməyin, Müaviyənin sənin üçün hazırladığı səfərin ən yaxşı azuqə olduğunu biləcəksən. And olsun Allaha, mən Allahdan başqasından qorxmur və ondan başqasına şikayət etmirəm. nə istəsən et, nə hiylə bacarsan işlət, nə düşmənliyin varsa göstər. And olsun Allaha, sənin üzərində olan bu pis ləkə heç vaxt təmizlənməyəcək. Şükr olsun Allaha ki, cənnət cavanlarının ağalarının işini səadətlə sona yetirdi. Behişti onlara vacib etdi. Allahdan istəyirəm onların dərəcələrini artırsın .və öz rəhmətini onlara sayə etsin, çünki O, çox qüdrətlidir

Dəməşq camaatı yavaş-yavaş İraqda baş verən hadisənin həqiqətindən xəbərdar“ oldular. Bildilər ki, Yezidin əmri və Kufə qoşunlarının əli ilə öldürülən sadəcə üsyançı yox, Allah Rəsulunun qız nəvəsi, bura əsir gətirilən əsir qadın və uşaqlar isə onların Peyğəmbərinin ailəsidirlər. O şəxsin ailəsi ki, Yezid onun canişini adı ilə onlara və başqa müsəlmanlara hakimlik edir. Dağlı ürəkdən və təqva dolu qəlbdən qüvvət alan danışığın nəticəsi məlumdur. Ən daş qəlbli insan belə, iman və təqva ilə qarşılaşdıqda öz gücsüzlüyünü və tərəf müqabilinin qüdrətini görür və bir müddət qərara gəlməkdə aciz olur. Bütün saraya ölümcül bir sükut çökmüşdü. Yezid saraydakıların üzündə narazılıq əlamətini görüb dedi: Allah öldürsün Mərcanənin oğlunu. Mən Hüseynin ölmünə razı deyildim. Sonra əsirlərin bu halda saxlanılmasının məsləhət olmadığını bilib, onlar üçün yaxşı yer hazırlanmasını əmr verdi və bildirdi ki, Qüreyş qadınlarından əsirləri görmək istəyənlərə mane olmasınlar. O Əli ibni Hüseyni hər günorta və axşam süfrə başına dəvət edir, onunla yemək yeyirdi. Körəsən doğrudan da Yezid zərrə qədər də olsa peşiman olmuşdurmu? – Bu köçəri camaatın işlərinin gedişini təhlil etdikdə belə bir güman oluna bilər, bu güman özünə yer tapmamış başqa bir xatircəmlik onu kənar edir. Belə ki, əgər Yezid belə etməsəydi, Kufə üsyanının Dəməşqdə də aşkar olacağı mümkün idi, baxmayaraq ki, onu tezliklə əzmək olardı. Hər halda bu gün və məclisin gedişatından Şam camaatının bir dəstəsi bildi ki,

.müsəlman onlar bildiyi kimi və hakim də onlara hakimlik edən şəxs deyilmiş

### QORXMAZLIQ ZİRVƏSİ

Həzrət Zeynəbin şücaətini, onun qəlbinin əzəmət və qüvvəsini daha düzgün dəyərləndirmək üçün Yezidin məclisinin ab-havası, o Həzrətin mənəvi vəziyyəti və .sözlərini daha yaxşı aydınlaşdırmaq lazımdır

Yezidin məclisinin ab-havası qorxu və vəhşətdən ibarət idi. Yezid özünü son dərəcə .qalib və güclü görürdü. Qoşun və camaat onun ətrafını tutmuşdular

Düşmənləri əsir edilmişdi, müxaliflərinin rəhbəri imam Hüseyn (ə)-ın müqəddəs başı onun qarşısında idi. Əsirlər bir dəstə qadın, uşaq və xəstə imam Səccad (ə)-dan ibarət idi. Yezid qürur və mənsəbpərəstlik məstində idi. Şam onun hökumətinin mərkəzi və camaat da atası Müaviyənin yetişdirdiyi camaat idi. Amma Zeynəb Mədinədən Məkkəyə, Məkkədən Kərbəlaya və Kərbəladan Kufəyə və Kufədən Şama qədər olan səfər boyunca, aləmin ən böyük müsibətləri çəkdirilmiş, bu təhlükə dolu səfərində bir az da rahatlanmamış, heç bir şəxs və ya qüdrətin köməyi olmadan, əsirlər karvanının böyüklüyünü öhdəsinə almış, onları hər yerdə qoruyub saxlamışdı. İndi isə Allah Rəsulunun balalarının vəziyyətini, imam Səccad (ə)-ın zəncirlənmiş əl-qolunu və .Yezidin, qardaşı imam Hüseyn (ə)-ın müqəddəs başını təhqir etdiyini görürdü

Belə bir şəraitdə danışmaq böyük bir ruh və əzəmətli şücaət istəyir. Əli və Fatimənin qanı damarlarından axan Zeynəb belə bir şücaət və qorxmazlıqla zəmanənin ən böyük bütünə qarşı çoşub, onun bütün üzdəniraq əzəmət və izzətini sındıraraq, Əhli-beytin .məzlumiyyət fəryadını zaman durduqca yayır və yatmış vicdanları oyadır

## ZEYNƏBİN SÖZLƏRİNƏ BİR NEÇƏ İŞARƏ

Zeynəbin sözləri elə məntiqi və kəskin idi ki, heç kəsin onun qarşısında dayanmağa cürəti çatmadı. Zeynəbin sözlərinin qətiyyət və əhatəliyi Yezid kimi çirkin bir şəxsiyyətin bütün cəhətlərini göstərdi, Peyğəmbər və xanədanının böyüklük və kəramətini yada salıb, ilahi dəyərləri öz ziddlərindən ayırdı. Bu sözlərin mühüm məsələlərlə dolu olmasına baxmayaraq, burada o əbədi danışıqdan bir neçə mühüm .məqama işarə edirik

## QARA QOVLUQ VƏ MURDARLIĞIN KÖKLƏRİ

Zeynəbin sözlərinin cəlbedici cəhətlərindən biri Yezidin qara qovluğunu və murdarlığın .köklərini ifşa etməsidir

Zeynəb Yezid xanədanının çirkinliklərini sayır və heç kəsin inkar etməyə qürdrəti çatmır. Ey Yezid, sən Hindin balasısan. Həmin qadın ki, Ühüd döyüşündə Allah Peyğəmbərinin şücaətli sərdarı Seyyidüş-şühəda Həmzənin ciyərini çeynəyib yerə .atdı. Belə napak xanədandan Kərbəla faciəsindən başqa bir şey gözlənilmir

Zeynəb başqa bir yerdə Yezidə «İbnit-tuləqa» "köləlikdən azad olunmuşların oğlu" – deyə xitab edirdi. Bu söz Məkkə şəhərinin fəthi və Qüreyş başçılarının azadlığına işarədir ki, uzun illər Peyğəmbərlə döyüşüb düşmənçilik etmişdilər. Peyğəmbər isə :kəramətlə onları azad edib buyurdu

.«İzhəbu əntumut-tuləqa»

Yəni, "gedin siz hamınız azadsınız." Bəli Yezid Peyğəmbərin azad etdiklərinin balasıdır ki, indi Peyğəmbərin xanədanını əsir edibdir. Zeynəb bu sözlə Yezidə səh:۵۳

anlatdı ki, həqiqi əsir sənsən. nə bizim əsirliyimiz zillətimizə sübutdur, nə də sənin qüdrətin qələbə və kəramətinin nişanəsidir.

Zeynəbin sözlərinin bu hissəsindən sonra onun islam tarixindən geniş və dəqiq məlumatlı olduğu görünür.

### ALLAH VƏ ŞEYTAN DƏSTƏLƏRİ

Zeynəb öz xanədanının iftixarlı adını Allah dəstəsi və Yezidin napak xanədanının Şeytan dəstəsi adı ilə tanıtdıraraq buyurur: çox təəccüblüdür ki, Allah dəstəsi Şeytan dəstəsinin və azad olunmuşların əli ilə öldürülsün. Bizim canımız sizin pəncələrinizin ucundan axır və ətlərimiz ağzınızdan tökülür.

### HİCAB VƏ İFFƏTİN QİYMƏTİ

İmanlı və Əhli-beyt sevər qadınlar üçün Zeynəbin kəlamından alınası öyüd hicab və iffətliyin dəyərli öyüdüdür. Zeynəb Peyğəmbər xanədanının qız və qadınlarının əsir olunması, onların şəhərlərdə küçə və bazarlarda gəzdirilməsi, napakların gözü qarşısında qalmalarına kəskin etirazını bildirir və onu ədalətsizliyin aşkar nümunəsi bilirdi. Bu həssaslıq, müsəlman qadının hicab və iffətinin əhəmiyyətinin göstəricisidir ki, gərək həmişə onu qorusun.

### DÜZGÜN FİKİR

Zeynəb sözünün axırında qəti bir səs və dərin bir baxışla buyurur: «Ey Yezid, nə qədər məkr və hiylə varındır işlət, nə qədər gücün var çalış. Amma Allaha and olsun, heç vaxt bizi yaddaşlardan silib Allahın vəhyini boğa bilməzsən».

Bil ki, sənin fikrin süst və hakimiyyətin puçdur... Şükr olsun o Allaha ki, bizim əvvəlimizi səadət və məğfirətlə xətm etdi, axrımızı şəhadət və rəhmətlə nicat verdi. Zeynəb dediyi kimi də oldu.

### ZEYNƏBİ-KUBRA VƏ BAŞQA BİR VƏZİFƏ

Yezidin məclisində əsirlərin arasında imam Hüseyn (ə)-ın kiçik yaşlı qızlarından birinin məsum çöhrəsi ay kimi parıldayırdı. Bu səfərdə əziyyət çəkib müsibət görməyinə

baxmayaraq çöhrəsinin gözəlliyi qəmli simasından bəlli idi. Bu gözəllik Yezidin tərəfdarlarından şamlı bir kişinin diqqətini cəlb etdi. Yezidə dedi: Bu qızı mənə bağışla! Fatimə bibisi Zeynəbin paltarına sarıldı və dedi: Bibican yetim olmuşam. Gərək kəniz də olam? – Zeynəb bu vaxt üzünü şamlı kişiyə tutub dedi: Yalan dedin, alçaqlıq etdin. nə sənin belə bir haqqın var, nə də Yezidin. Yezid bu sözü eşitməklə halı dəyişdi və dedi: Belə haqqım var, əgər istəsəm edərəm. Zeynəb onun cavabında buyurdu: Heç vaxt bacarmazsan, çünki, Allah sənə belə haqq

verməyib. O vaxt edə bilərsən ki, bizim dinimizdən çıxıb başqa dini seçəsən. Yezid dedi: Atan və qardaşın dindən çıxdılar, Zeynəb buyurdu: Əgər müsəlmansansa, babamın, atamın və qardaşımın dininə hidayət olubsan! Yezid özünü Zeynəbin sözünün qarşısında aciz görüb söyüş silahını aldı və dedi: Ey Allahın düşməni yalan deyirsən! Zeynəb buyurdu: Sən indi əmirsən və zülmlə söyüş verirsən, öz qüdrətini gözə soxub .meydan oxuyursan. nəhayət Yezid guya xəcalət çəkirmiş kimi sakit oldu

Bu Zeynəb idi ki, hər bir istəyinin icra olunacağını guman edən Yezidin qarşısında .dayandı və onu başqalarının gözü qarşısında diz çökdürdü

## BEŞİNCİ FƏSİL

## MƏDİNƏYƏ QAYIDIŞ

Hərəmin astanasında

Vəfat

Xanım Zeynəbin Yezidin sarayında və imam Səccadın Şam məscidindəki təsirli və ifşa edici çıxışları. Müaviyənin Əhli-beyt (ə) əleyhinə olan ۴۰ illik zəhərli təbliğatına son .qoydu. Bəni Üməyyənin cinayət və azğınlıqları ifşa edildi

Onların çirkinlikləri aşkar olundu. Şam camaatı özlərinə gəlib, uzun illər islam və Peyğəmbərin canişini adı ilə onlara hakimlik edən Müaviyə və Yezidin qan içən bir .vəzifəpərəst olduqlarını başa düşdülər

Belə rüsvay olacağını güman etməyən Şam hökuməti Əhli-beytin Şama gəlişi, nitqləri və camaatın agahlığı ilə öz mevqeyini təhlükədə görüb çarə axtarmaq fikrinə düşdü. Şam hökumətinin, ümumi fikirlərlə razılaşmaq və millətin qəzəbini soyutmaqdan başqa çıxış yolu qalmadı. Buna görə də Əhli-beytlə xoş davranmağı qərara aldı. Belə ki, Əhli-beytin Seyyidüş-şühəda (ə) üçün üç gün əzadarlıq məclisi qurması istəyini yerinə yetirdi, hətta Şam sarayının qadınları da məclisdə iştirak edirdilər. Günlər .keçdikcə Şam camaatı ayılır və Şam hökumətinin əməllərinə daha da qəzəblənirdilər

Bu səbəbdən Yezid Əhli-beytin Şamda qalmağını özünə və hökumətinə məsləhət görməyib, karvanı ilk fürsətdə Mədinəyə göndərməyi qərara aldı. Karvanı onunla birgə

Mədinəyə göndərmək üçün, Peyğəmbər səhabələrindən olan nöman ibni Bəşiri yanına çağırdı. nöman səfər boyunca Allahın peyğəmbərinin xanədanı ilə mehriban davranır .və imkan qədərincə onların istəklərini yerinə yetirirdi

## MƏDİNƏYƏ DOĞRU

Aşura karvanı uzun səfər və çətin bir yol keçdikdən sonra və qanlı Aşura hərəkatını səmərələndirdikdən sonra Mədinəyə qayıdırdı. Onlar nə qədər çətin və

əziyyətli günlər yaşamış və nə qədər ömür azaldıcı müsibətlər görüb, dil yaraları eşitmişdilər! Kərbəladan Kufəyə və Kufədən Şama qədər bütün yollar əziyyət və çətinliklərlə dolu idi. Kufədə İbni Ziyadın məclisi və Şamda Yezidin məclisi, bütünlüklə hər yer məzəmmətlə dolu idi. Artıq aləmlərin müsibətini çəkmiş, yorğun bədənli, sınıq qəlbli, dərdli, qəmli məzəmmət və dil yarası eşitmiş. Amma eyni halda etdiyi böyük iş üçün, bəşərin tarix və müqəddəratında əmələ gətirdiyi böyük dəyişiklik üçün iftixar və baş ucalığı hiss edən bu karvan Mədinəyə doğu hərəkətdədir. Camaatın Əhli-beyt (ə)-ın Şama daxil olduğu vaxtdakı şadlıq və gülüşü indi artıq peşimançılıq və göz yaşı ilə əvəz olunmuşdur. Camaat öz göz yaşları ilə karvanı müşayət edir və öz nalələri ilə Əbu .Süfyanın ünvanına lənət göndərirdilər

Karvan nömanla birgə Mədinəyə tərəf dönür. Zeynəb həmin karvanla Mədinədən Məkkəyə doğru və Məkkədən də Kərbəla səmtinə hərəkət etdiyi günü unutmurdu. Həmin karvan ki, rəhbəri Hüseyn (ə) idi, Əbbas və Əliəkbər kimi ay üzlü igidləri və özü ilə birgə qardaşı imam Müctəba (ə)-ın yadigarı var idi. Qardaşı Hüseyn (ə)-ın aram və nurani çöhrəsi, Əbbasın şücaət və vəfası, Qasimin paklığı və səfası, Əli Əkbərin .Peyğəmbərə oxşarlığı, və s... Zeynəbin yaddaşından silinmirdi

## HƏRƏMİN ASTANASINDA

Karvan anbaan Mədinəyə yaxınlaşırdı. Həzrət Peyğəmbərin pak qəbrinin ətri duyulurdu. Əzizlərin yoxluğunun xatirəsi əvvəlkindən daha çox hiss olunur və dərdlər bir-birinin ardınca təzələnirdi. Hamı bunu düşünürdü ki, imamın şəhadət xəbərini ?Mədinə xalqına necə çatdırsın, Mədinəyə necə daxil olsunlar və necə qalsınlar

O Mədinə ki, Hüseyni yoxdur, Əbbası yoxdur, Əliəkbəri, Ounu, Cəfər və s.. yoxdur. Bu yoxluğa dözməyə necə bacarmaq olar? Karvan əhlinin hər biri babaları Peyğəmbərin pak qəbrinə ürək dərdlərini deyir, dözdükləri böyük müsibət, əziyyət və çətinliklərdən .gileylənirdilər

Karvan imam Səccad (ə)-ın göstərişi ilə Mədinə yaxınlığında dayandı. Yükləri açdılar, xeymələri qurub, qadın və uşaqları aşağı endirdilər. Camaat Mədinəyə daxil olmazdan :qabaq böyük bir xəbərdən agah olmalıdır. İmam, Bəşir ibni Cəzləmi çağırır

?Bəşir! Allah sənin atana rəhmət etsin ki, şair idi, sənin də şairlik qabiliyyətin varmı

.Bəli, ey Allah Rəsulunun övladı, mən də şairəm

.Mədinəyə get və Hüseyn (ə)-ın şəhadət xəbərini Mədinəyə çatdır

.Bəşir deyir: Ata minib Mədinəyə doğru tələsdim

Peyğəmbər məscidinə gəlib gözlərimdən yaş axa-axa şivən ilə fəryad etdim. Bu şeri :qoşub uca səslə oxudum

Ya əhlə yəsribə la muqamə ləkum biha

Qutiləl Huseynu fəədmui midrar

Əlcismu minhu bi kərbəla muzərrəc

Vər-rəsu minhu ələl qənati yudar

Ey Mədinə camaatı! Mədinədə qalmayın, çünki Hüseyn (ə) öldürülüb. Buna görə də gözlərimdən su sel kimi axır. Hüseynin cəsədi Kərbəlada qan və torpaq arasına düşüb .və müqəddəs başını nizə üzərində, şəhərlərdə gəzdirirlər

Bu vaxt fəryad qopardım: Ey Mədinə camaatı! İndi Əli ibni Hüseyn öz bibiləri və bacıları ilə Mədinənin yaxınlığındadır. Mən imam Səccadın sizin tərəfinizə göndərdiyi şəxsəm .və onun yerini sizə göstərəcəyəm

Bəşir deyir: Qadınlar hamısı şivən edən halda evlərdən bayıra töküldülər. Mən camaatı heç bir zaman o günkündən çox ağlar görmədim və müsəlmanlar üçün o gündən acısını müşahidə etmədim. Mədinə camaatı Bəşirlə birgə Əhli-beytə doğru tələsdilər. İmam Səccad camaat üçün xütbə oxudu və Allahın onlara nəsib etdiyi və öhdəsindən gəldikləri böyük bir imtahan üçün Allaha şükr deyib, hamını Peyğəmbərin pak ailəsinə üz verən böyük müsibətlər, çətinliklər və hadisələrdən xəbərdar etdi. Camaat şivən edə-edə Əhli-beytlə birlikdə Mədinəyə daxil olurdu. Əhli-beytin gözü Peyğəmbərin pak qəbrinə düşcək “Va Məhəmmədа” fəryadı ucaldı və Peyğəmbərlə dərdləşməyə başladılar. Ey Allahın Rəsulu! Sənin Hüseynini susuz şəhid etdilər və Əhli-beyti əsir tutdular. Mədinə camaatı onların səsinə səs verdilər. Ağlamaq və şivən səsləri qarışdı. Bütün Mədinə ağladı. Sanki darvaza və divar da ağlayırdı. Zeynəb Peyğəmbərin məscidinə yetişən kimi qapının iki tərəfini tutub belə dedi: Ey Allahın Rəsulu! Mən Hüseynin ölüm xəbərini gətirmişəm sənə. Ondan sonra Zeynəbin gözləri həmişə yaşlı .olardı. İmam Səccada baxanda dərdi, qəmi təzələnərdi

Təbidir ki, Zeynəb sakitləşmir və Aşura hadisələrini danışmaqla camaatda dəyişiklik edir, həyacanlandırırdı. Camaat oyanır və imam Hüseynin intiqamını almaq üçün .ayağa qalxırdı

İmam Hüseyn (ə) bir dəfə şəhadətə yetişdi, amma onun carçıları öz haqtələb .fəryadlarını islam və bəşəriyyət aləminə yetirdilər

## VƏFAT

Mədinəyə daxil olduqdan sonra əzəmətli Zeynəb günəşinin şüası bir ildən artıq davam gətirmədi. Həmin Hüseynsiz bir illik həyat Zeynəb üçün çətin oldu. Həmin Zeynəb ki, uşaqlığından cavanlığa və cavanlıqdan imam Hüseynin şəhadətinə qədər olan ömrünü onunla idi və ona məhəbbət bəsləyirdi. Əgər xanım Zeynəbin uca məqamlı səbr və təslimi olmasaydı, kifayət idi ki, imam Hüseyn (ə)-dan sonra Kərbəla və Aşura xatirələrinin hər birini xatırlayıb təzələməklə can tapşırıb, dünya

yaşayışı ilə vidalaşaydı. Amma o, Allahın layiqli bəndəsidir. O, Allaha bəndəliyini müxtəlif sahələrdə göstərərək «Fəsbir səbrən cəmilən» "Gözəl səbr et" fərmanına cavab verdi və qardaşı Hüseyn (ə) kimi, "gözəl səbr" surətini bəşəriyyət tarixinin .səhifələrinə həkk etdirdi

Belə uca bir ruhla və bu növ əzəmətli həyatdan sonra haqqın tükənməz rəhmətinə və pak ailəsinə qovuşmaqla yaxşı yaşamaq, Allaha itaət, iffət, isar, fədakarlıq, əhdə vəfa .və Allah yolunda səbr və dözüm dərsini hamıya göstərdi

Dünyaya göz açdığı, dünyadan köçdüyü və pak əcdadı ilə fəxrlə qəbrdən qalxacağı !zaman salam olsun ona

## SONUNCU FƏSİL

### İNSANLIĞINƏZƏMƏTİ

İnsanlığın əzəməti

İbadət və bəndəlik

Təfəkkür və tədbir

İsar və fədakarlıq

Səbr və dözüm

Kitabın sonunda münasibdir ki, Zeynəb (s)-ın saysız-hesabsız fəzilətlərinin bəzi cəhətlərinə nəzər salıb, onun simasını insana aid olan uca ləyaqətlər güzgüsündə .görək və kamillik yoluna o böyük xanımdan ilham almaqla qədəm götürək

### İBADƏT VƏ BƏNDƏLİK

Allaha bəndəlik və ibadət bəşərin ən böyük fitri ehtiyacının təminatçısıdır və insanın inkişafı, kamilliyi bu bəndəliklərin sayəsində müyəssər olur. İnsan bu bəndəliklə kamala əl tapır və mələklərdən önə keçərək yer üzündə Allahın canişini və mələklərin .səcdəgahı olur

Bəndəlik bütün vücudu ilə öz ağa və məbudunun qulluqunda olmaq, onun fərmanından başqasına qulaq asamamaq, ondan başqası üçün iş görməmək və onun razılığından başqa bir şey düşünməmək deməkdir. Bəndəlik və ixlasın mənası budur. İnsanın bəndəliyinin qədəri onun Allaha olan mərifətinə bağlıdır. Buna əsasən Allahı yaxşı tanıyıb varlığı yaradanın əzəmətini dərk edənlər özlərinin Allaha olan möhkəm .aslılıq və ehtiyaclarını anlayır və ona ibadət üçün baş əyirlər

Peyğəmbər və imamlar mərifətin uca zirvəsində, ibadət və bəndəliyin nəhayətindədirlər. Bu xanədanın əzəmətli ağacının bir qönçəsi olan Zeynəb onların məktəbində tərbiyə almış, bəndəlik və ibadət dərsini yaxşı öyrənmişdir. Belə ki, onun bəndəliyinin əzəmətini həyatının bütün mərhələlərində görürük. Böyük və əzəmətli Allaha əlaqəsini, ibadət və namazlarını həyatının ən çətin mərhələlərində müşahidə

edirik. Həyatın eniş-yoxuşları nəinki onu Allahın ibadət və bəndəliyindən qafil etməyib, hətta onun bəndəlik və ibadət cilvələri çətinliklərdə daha çox özünü büruzə verir. O, gecə yatmamaq və məbudu ilə razi-niyaz etməyin aşiqi, gecə oyaqlıqlarının və gecə yarısı ahlarının tərbiyələndirdiyidir. İmam Hüseyn (ə) Zeynəbin uca məqamına hamıdan yaxşı bələddir. Ona görə də Aşura gününün sonuncu vidasında bacısına :buyurdu

.«Ya uxtah, la tənsini fi nafilətil-ləyl»

Bacıcan, gecə namazında məni unutma". Həmçinin imam Hüseyn (ə)-ın qızı" Fatimədən belə nəql olunurdu ki, bibim Zeynəb Aşura gecəsi bütün gecəni ibadət mehrabında dayanıb, öz Allahı ilə münacat edərək onun dərgahından kömək diləyirdi: nə bizim göz yaşımız bir anlığa dayandı və nə naləmiz kəsildi. Bu cəhətdəndir ki, imam Səccad (ə) buyurur: Bibim Zeynəb Kərbəladan Şama qədər olan əziyyət və çətinliklərə baxmayaraq gecə nafilələrini qılır və bütün çətinliklərlə belə öz ibadətlərini unutmurdu. Zeynəbin qorxmazlığı, şücaəti, ürək qüvvəti və aramlığı həmin Allaha təvəkkülündən qaynaqlanırdı. Yezidin sarayındakı kəskin sözləri və o zəhərli fəzada "nəhy əz munkər" etməsi səfərin bütün mərhələlərində ismət və həyasını qoruyub saxlaması, hər yerdə .öz vəzifəsinə əməl etməsi, hamısı bütünlüklə Zeynəb bəndəliyinin cilvələridir

## TƏFƏKKÜR VƏ TƏDBİR

Zeynəbin mühüm xüsusiyyətlərindən biri onun elmi və savadıdır ki, bunun dərinliklərini onun çıxış və nitqlərində görmək olur. necə ki, imam Səccad (ə) Kufə bazarında :Zeynəbin bu xüsusiyyəti ilə iftixar etdi və buyurdu

.«Ənti bihəmdillahi alimətun ğeyru muəllimətun və fəhimətun ğeyru mufəhhəmətun»

."Allaha şükr olsun ki, sən təlim olunmamış alim və öyrədilməmiş müdriksən"

Zeynəb bütün mərhələlərdə öz vəzifəsi ilə tanış idi. Sükut edilməli yerdə sükut, fəryad edilməli yerdə fəryad və canfəşanlıq edilməli yerdə canfəşanlıq edirdi. Əhli-beyt karvanını idarə etməkdə isə tədbiri çox heyrətamiz idi. Qadının şəfqət və hissiyatlarla dolu olmasına baxmayaraq, heç vaxt bu hissiyat Zeynəbin düşüncə və tədbirinə qalib olmadı, onu öz ilahi vəzifəsindən qafil etmədi. O, ən qorxulu səhnələrdə düşüncə ilə

davrandı və buna görə də “Əqileye bəni haşim” yəni, bu xanədanın bilikli qadını adı ilə .tanındı

## İSAR VƏ FƏDAKARLIQ

Zeynəb, Əli və Zəhranın qızıdır, o ailə ki, “Həl əta” surəsi onların şənində nazil olub, onları xaliscəsinə etdikləri isara görə tərif etdi. özündən keçmək və başqalarını özündən qabağa salmaq Peyğəmbər xanədanın xüsusiyyətlərindəndir. Bu xanədandan olan və tovhid məktəbindən dərs alan Zeynəb, öz yaşayışının

hamısında, xüsusi ilə Seyyidüş-şühəda hərəkatında öz rahatlıq və asayişinə göz yumdu. Və fədakarcasına özünü və əzizlərini Allah yolunda fəda etdi. Bütün çətinlikləri canına alıb dözdü. Onun böyük Kərbəla hərəkatındakı fədakarlıqları tarixin dillər əzbəridir. O, çətinliklərdə özündə keçdi və fədakarcasına davrandı. çətinlikləri qarşılamaqda qabaqcıl idi və onların qarşısında nəhayət dərəcədə müqavimət göstərirdi. Səfər boyunca uşaqları və karvan əhlini himayə edir və hətta öz yemək :payını da başqalarına verirdi. İmam Səccad (ə) buyurur

Bibim Zeynəb Kufədən Şama qədər bütün müstəhəb və vacib namazlarını yerinə yetirdi. O, mənzillrdən birində zəiflik və aclığın şiddətindən oturaq halda namaz qıldı, .çünki üç gün idi öz yemək payını kiçik yaşlı uşaqlara verirdi

Zeynəbin bütün bu fədakarlıqları öz məqsəd və yoluna imanı olduğu üçün idi və o yolda heç cür canfəşanlıqdan sıxılmırdı. Bəlkə də əziz Peyğəmbərin Zeynəbin təvəllüdü vaxtında buyurduğu "hamının bu qıza hörmət etməyini vəsiyyət edirəm, çünki, o Xədicəyə oxşayır" kəlamı onun Allah yolunda fədakarlıq və özündən keçmə ruhiyyəsində olduğu üçün idi. Axı Xədicə də belə idi. Peyğəmbərin tək olduğu vaxtda Xədicə bütün var-dövlətini və öz mevqeyini fədakarcasına islamın inkişafı yolunda sərf etdi. Zeynəb də imam Hüseyn (ə)-ın kənarında və onunla birgə Allahın dinini qorumaq .yolunda hər şeydən keçdi

**SƏBR VƏ DÖZÜM**

Həqiqi səbri yalnız imanın yanında axtarmaq lazımdır. Həqiqi səbr edən düzgün mömindir. İman və səbrin əlaqəsi o qədər səmimi və bir-birinə bağlıdır ki, rəvayətlərdə .onların ikisinin baş və bədən ifadəsi ilə adları çəkilibdir

.«Əssəbru minəl imani bi mənzələtir–rəsi minəl cəsəd»

Səbrin imana nisbətən mövqeyi, başın bədənə nisbətən olan mövqeyidir". Bu təbir" imanın həyatı və mömininin inkişaf və tərəqqisinin, onun səbrinin sayəsində olduğunu, səbirsiz möminin imanının get-gedə aradan getməsini bəyan edir. İmanla yaşamaq və öz vəzifə və borcunu yerinə yetirmək səbirsiz mümkün deyil. Bu səbəbdən səbr barəsində olan rəvayətləri üç hissəyə – itaət bərabərində olan səbr, günah

bərabərində olan səbr və müsibət üz verən zaman səbr etməyə bölmüşlər. Allaha .bəndəlik, Şeytan qarşısında dözüm – hamısının qarşısında səbrə ehtiyac var

Mömin insanın yaşayışında qarşılaşdığı çətinliklərin müxtəlif əsərləri var. Allah yolunun çətinlikləri və müsibətlərinin qiymətli əsərlərindən biri insanın inkişaf və kamilliyidir. Yəni, Alah yolunun çətinlikləri, həmişə insanın inkişaf səviyyəsini formalaşdırır. necə ki, Əli (ə) buyurur: İnsan imanın həqiqətini bu üç xüsusiyyətə malik olmasa dərk edə bilməz: Dindən xəbərdar olmaq, çətinliklərin qarşısında səbrli olmaq və yaşayışını idarə etməkdə yaxşı tədbirli olmaq. Görün ki, həyat çətinlikləri qarşısında insanın səbr .etməsi imanın həqiqətini dərk etməyə zəminə yaradır

Allah yolunda çəkilən çətinliklər və müsibətlərin başqa bir təsiri axirətdə insana nəsib olan səvab və nemətlərdir. İmam Sadiq (ə) belə buyurur: Allah insana həyatın

çətinlikləri, xəstəliklər, qohumların müsibəti, iqtisadi problemlər və dünya bəlaları ilə öz nəzər diqqətində yer verir ki, ona səbr və əcr əta etsin. Bəzən isə kamillik və behişt nemətlərinə yetişmək, yalnız həyatın çətinlik və müsibətlərindən keçməklə müyəssər .olar. Bu barədə bir rəvayətə diqqət edin

İmam Sadiq (ə) buyurur: Bəzən bəndənin Allah yanında dərəcə və məqamı olur. Lakin bəndə bunu öz əməlinin vasitəsi ilə əldə etmir. Buna görə də Allah onu xəstəliyə, fəqirliyə və ya övlad müsibətinə mübtəla edir. Əgər bu bəlaların qarşısında səbr edərsə Allah ona o dərəcə və məqamı verir. Bu imam Hüseyn (ə)-ın sözləridir ki, öz yol :yoldaşlarına buyurur

.«Fələmu ənnəllahə innəma yəhəbul mənaziluş-şərifətə li ibadihi bi ihtimalil məkarihi»

.«Bilin ki, Allah çətinliklərə dözməklə bəndələrinə dəyərli məqam və dərəcə verir»

Yaşayışın gətirdiyi çətinlik və müsibətlər üçün deyilən qiymətlərə nəzər salmaqla belə nəticə almaq olar ki, imanlı insanlara üz verən müsibət və çətinliklərin iki cəhəti vardır: Biri xoşa gəlməz və pis olan zahiri cəhəti, digəri isə çox gözəl olan həqiqi cəhəti. Bu cəhətdən də rəvayətlər, müsibətləri möminlər üçün ilahi hədiyyə və töhfə kimi .tanıtdırır

.«Əl məsaibu minhun minəllah»

.«çətinliklər Allah tərəfindən hədiyyədir»

Odur ki, görürük Allah peyğəmbərləri və övliyaları, müsibətlərin gözəl üzünü görürlər və onun qarşısında təslim və razı olurlar. Yəni, müsibətin baş verməsi ilə bağlı heç bir .şikayət və giley-güzar olmadığından əlavə razı və şaddırlar

Həqiqəti görən Zeynəb, müsibətlərin və çətinliklərin gözəl və həqiqi üzünü gördükdə, onlara yaxşı gözlə baxır və onların qarşısında səbr edir. Zeynəbin həyatı həmişə – uşaqlığından bəri, böyük müsibətlərlə yoldaş olub, babası Peyğəmbəri əldən vermək müsibəti, anası Fatimənin müsibətləri, atası həzrət Əli (ə)-ın şəhadət müsibəti, qardaşı imam Həsən (ə)-ın şəhadət müsibəti və Kərbəlanın saysız-hesabsız üzücü müsibətləri ki, dünyanın ən böyük müsibəti sayılır. Zeynəb bu müsibətlərlə səbr və düşüncə ilə

qarşılaşdığından onun adı səbrlə qoşa çəkilir. Zeynəbin səbrini övladları, qardaşı, qardaşı balaları və başqa qohumlarının şəhadətində müşahidə etmək olar. Xanımın səbrini südəmər uşağın atası Hüseyn (ə)-ın qucağında şəhid olarkən tamaşa etmək olar. Onun səbrini imam Hüseyn (ə)-ın və başqa şəhidlərin cəsədləri yanında imam Səccad (ə)-a ürək-dirək və təsəlli verərkən görmək olar. Və nəhayət həzrət Zeynəb səbrinin əzəmətini, onun İbni Ziyad qarşısında, bütün bu müsibətlərə gözəl mövqeyini .bəyan edəndə görmək olar

.«Ma rəəytu illa cəmilən»

.«Gözəllikdən başqa bir şey görmədim»

Allahın salamı olsun Zeynəbi-Kubraya və Allah yolunun bütün fədakarlarına ki, .Zeynəbdən dərs alaraq səbr etməyi öz həyat dəftərlərinin sərlöhəsinə yazıblar

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

İsfəhan **Qaimiyyə** kompüter araşdırmalar mərkəzi



# Qaimiyyə



Başqa kitabxanaya sahiblənmək üçün gördüyünüz sayt mərkəzinə müraciət etməniz lazımdı:

**www.Ghaemiyeh.com**

www.Ghaemiyeh.net

www.Ghaemiyeh.org

www.Ghaemiyeh.ir



Və sifariş üçün bizimlə əlaqə saxlayın:

**(0098)0913 2000 109**